**BBK.47**
**S-47**

***Redaktor:***
**Araz YAQUBOĞLU**
*"Qızıl qələm" mükafatı laureatı*

***Ön sözün müəllifi:***
**Qılman İMAN**
*Prezident təqaüdçüsü,*
*Azərbaycan Yazıçılar Birliyinin üzvü*

***Məsləhətçi:***
**İlham XƏLİLOV**

**S-47** **Sərraf Şiruyə**
**Ayrılıq belə düşdü** (dastan-poema)
Bakı, "Qismət", 2014. – 224 səh. + 52 səh. şəkil

**ISBN** 978-9952-8231-1-0

# TARİXİN HƏQİQƏTİ, HƏQİQƏTİN TARİXİ

Dünyanın inkişaf mexanizmi dəyişdikcə, ədəbi düşüncəmizdə yeni bir təkamül prosesi başlayır. Bu inkişaf mexanizminin təzahürü daha qabarıq formada ədəbiyyatda əks olunur. Ədəbiyyat həyatın bədii inikası olduğundan həyatda gördüyümüz mənfi və müsbət hadisələrin hamsı oxucu kütləsinin düşüncəsinə hakim kəsilir. Dünənin, bu günün və sabahın problemləri ədəbiyyatın tərkib hissəsi kimi müasir insan düşüncəsinin qəbul etdiyi formada təqdim olunur. Bizi əhatə edən bu qlobal dünyada təkcə mövzular, problemlər dəyişməyib, həm də həyat hadisələrinin fonunda sözün daxili forması və intonasiyası dəyişib.

Söz dünyanın içində gizləndiyi kimi, dünya da sözün bətnində gizlənib. SÖZ adlı səngərdə mənəvi dünyasının keşiyini çəkənlərin xoş halına!

Bu gün poeziyada klassik bir ənənəsi olan poema janrının bir qədər gözəgörünməzliyə çəkilməsi, zamanın təbəddülatı ilə formalaşan, texniki bazasını genişlənirdən sivil insan düşüncəsinin müəyyənləşdirdiyi sərhədin imkanı xaricindədi. Ona görə də poema janrı bu gün hamı üçün yox, intellektual "təklər" üçün daha önəmlidi. Ağır zəhmət, böyük istedad hesabına yazılan bütün ciddi sənət əsərləri (o cümlədən poemalar) zamansızlıq sindiromunu sındıraraq bu gündən çox, gələ-

cəyə ən böyük töhfədi. Tarixi həqiqətlərin bədii ədəbiyyata transfer olması genetik yaddaşımıza qayıdışın ən gözəl vasitələrindəndi. Tarixlə bədii ədəbiyyatın harmoniyası həqiqətin "vərəsəlik hüququ"nun daşıyıcıdı. Zamanın ən ağır məngənəsindən cəsarətlə sivişib çıxan tarix və ədəbiyyat doğma qardaş kimi hələ də birlikdə addımlamaqdadı.

Sərraf Şiruyə çox əsirlik xalq şeirimizin müasir dövrdə ünlü təmsilçilərindən hesab olunur. 50 illik yaradıcılığı zamanın da saya gəlməz dərəcə də oxucu kontingentinin rəğbətini qazanıb. Uzun illər şeirləri sovet qlavnitinin "dəmir məngənə"sindən keçməsə də, şifahi şəkildə xalq tərəfindən yaddaşlara köçüb, sovet senzurasının təhlükələrindən hifz olunub. El məclislərində şirin-şirin təcnisləri, qoşmaları, gəraylıları aşıqlar, xanəndələr tərəfindən sevilə-sevilə ifa olunub, oxucuların, dinləyicilərin könül dünyasını işıqlandırıb. Sərraf Şiruyə yaradıcılığında əzəli-əbədi türk torpağı olan Göyçə faktoru demək olar ki, əsərlərinin əsas leytmotivini təşkil edir. Ona görə də ədəbiyyatmızda, folklorumuzda Göyçəşünaslığın ən zəngin qollarından biri kimi Sərraf Şiruyə yaradıcılığını göstərmək olar.

Sərraf Şiruyə "Ayrılıq belə düşdü" adlandırdığı poeması yenə də əbədi mövzusu olan Göyçə və göyçəlilərə həsr olunub. Şair ilk növbədə Göyçənin tarixini, etnoqrafiyasını, qənirsiz təbiətini, azman saz-söz sənətkarlarını, cəsur, igid oğullarını poetik qüdrəti ilə xrono-

loji ardıcıllıqla xatırlayır. XX əsrin əvvəllərində Göyçədə cərəyan edən hadisələrin – sovet sosrealizminin gətirdiyi bəlaların, ermənipərəst qüvvələrin müsəlmanların qanı bahasına törətdiyi cinayətlər, qaçqınlıq-köçgünlük səfaləti əsərin tarixi və bədii yükünü bir az da dərinləşdirir. Şair eşidib-bildiyi real faktları bədii lövhələrlə nəzmə çəkir. Əsərin əsas qəhrəmanlarından olan Qara Əzizin həyat hekayəti Göyçə mahalının Daşkənd kəndinin taleyinin tərkib hissəsi kimi qələmə alınır. Əziz kişinin övladlarının başına gələn müsibətlər, oğlu Niftalının Böyük vətən müharibəsində itgin düşməsi, zamanın tələbləri əsasında baş verir. Stalinin repressiya maşının sürətlə işlədiyi bir dönəmdə erməni məkiri ilə azəri türklərinin “kulak”, “qolçomaq” adıyla istismar edilib həbs olunması, tarixin danılmayan faktlarından biri kimi əsərin əsas məziyyətlərindəndi. Əsər mövzu etibari ilə poema janrından çox prazaik detalları ilə diqqət cəlb etdiyindən, şair hər bir hekayəti poetik qəlibə salaraq axıcı bir təhkiyə ilə nəql edir. Poema əsasən bədbin tarixi hadisələr üzərində köklənsə də, Əziz kişinin ortancıl oğlu Əli Xəlilovun böyüyüb ali təhsil alması, öz doğma kəndi Daşkənddə, qonşu Subatan kəndində təsərrüfat rəhbəri kimi çalışması, çevik zəkası sayəsində qardaşlarını, övladlarını qeyrətli bir türk kişisi kimi himayə etməsi, oxucunu bədbin ovqatdan ayırır. Sonralar Əli kişinin Allahın evini ziyarət edib “Kərbəlayı” adını qazanması, qardaşı Niftalının

uzun illərdən sonra Türkiyədə övladlarını, qəbrini ziyarət etməsi, oğlu İlhamın uşaqlıq xatirələri, İlham-Lena məhəbbətinin bu günki təzahürləri oxuculara mənəvi rahatlıq bəxş edə-edə uzun səfərlərə könül yoldaşlığı edir.

Ümumən bu poemanın Sərraf Şiruyə tərəfindən qələmə alınıb yazılması təqdirlayiq bir haldı. Çünki şairin iti qələminin nüfuzu sayəsində bu əsərdə tarix ədəbiyyata, ədəbiyyat adamlara, adamlar isə zamana qovuşur.

**Qılman İMAN,**
***Prezident təqaüdçüsü,***
***Azərbaycan Yazıçılar Birliyinin üzvü***

## DAŞKƏNDİM

***Qərbi Azərbaycanın Göyçə mahalının Daşkənd kəndinin xəyallarda qalan, könüllərdə yaşayan, hər an göz önünə gələn gözəllikləri və yaşayış tərzindən bəzi nümunələr, təsvirlər.***

Zirvələrdə dalğalanan, yellənən,
Sən Göyçəyə bayraq idin, Daşkəndim.
Qılınc qayalara,ləngər dağlara –
Özül idin, dayaq idin, Daşkəndim.

Qayaaltı, Qayaüstü kənd idin,
Qayalarla bir-birinə bənd idin.
Övladına şəkər idin, qənd idin,
Doğma, əziz qucaq idin, Daşkəndim.

Keçilməz sədd idi hər bərə, bəndin,
Cənubdan Qızıldağ[1] aşılmaz həddin.
Seryaqub, Qırxbulaq – iki sərhəddin,
Bu arada oylaq idin, Daşkəndim.

Kəmənd dağı kəməriydi belinin,
Gen dərələr yatağıydı selinin.
Bol süfrələr səxasıydı əlinin,
Bir dolu-tox bucaq idin, Daşkəndim.

---

[1] Qızıldağ – Azərbaycanla sərhəddə yerləşən dağ.

Qoynundaydı Həzrət Əli bulağı,
Həm imamın, həm Düldülün ayağı.[1]
Daşa düşüb bir möcüzə sayağı –
Dərddən, qəmdən uzaq idin, Daşkəndim.

On idimi, yüz idimi bulaqlar?
Nəğmələşən söz idimi bulaqlar?
Qışda büllur üz idimi bulaqlar?
Yayda Buzlu bulaq idin, Daşkəndim.

Mətah idi hər bir otun-əncərin,
Ələyəzin, Quşəppəyin, pencərin.
Əyiləndə bir adamla nəzərin,
Tez küsəyən uşaq idin, Daşkəndim.

Gül-çiçəyə bürünərdi dağların,
Başlayanda sazlı, sözlü çağların.
Müşgü-ənbər qoxuyardı bağların –
Bol-bəhrəli budaq idin, Daşkəndim.

Ayıdərə bir qorxulu ün idi,
Şəyirdərə kölgə düşməz, gün idi.
Ayrımdərə, Xəznədərə gen idi,
Sarıdərə, Çanaq idin, Daşkəndim.

Hər düşəndə qartal, quzğun davası,
Güdaza gedərdi kəklik balası.
Mətah idi qayaların xınası,
Hər bir rəngə boyaq idin, Daşkəndim.

---

[1] Düldül – Həzrət Əlinin atının adı.

Şamoyludan Qəfərliyə yan-yana,
Zağalar var idi – içi toyxana.
Ta Qaraburundan Hacı Qurbana,
Çınqıl idin, Yataq idin, Daşkəndim.

Uzun güney, Gödək güney cərgədə,
Mal-qoyuna çıxış idi hər vədə.
Sarı qaya qılınc idi kölgədə,
Sən nə gözəl oylaq idin, Daşkəndim.

Kəvəklinin yekə, yüngül kəvəyi,[1]
Bənzədirdi sanki xəlbir, ələyi.
Əsəndə dənizin bəzən küləyi,[2]
Yayda soyuq, sazaq idin, Daşkəndim.

Qocaman bulağı suyuydu kəndin,
Qayalar dayağın, keçidlər fəndin.
Hər kəs bərkidərdi bərəsin, bəndin,
Neçə elnən qaynaq idin, Daşkəndim.

Yalarx, Dalarx, Göytəpəydi ev qonşun,
Keçid, Dəmyə payızda da sərt qışın.
Hacı Söyün calasıydı bihuşun,
Belə gözəl yaylaq idin, Daşkəndim.

[1] Kəvəkli daş – bəzək üçün, çox yüngül və içi xəlbir kimi deşikli, məsaməli daş.
[2] Dəniz – Göyçə gölünə yerli əhali dəniz də deyirdi.

Yayılanda nənələrin nehrəsi,
Bişib yağlanardı pencər kətəsi.
Qoruncanın çiçək açan vədəsi,
Beçə balı, qaymaq idin, Daşkəndim.

Aşıq Alı baharını anıbdı,
Aşıq Nəcəf qaynar suda yanıbdı.
Aqil-arif səni çoxdan qanıbdı,
Hikmətli dil, dodaq idin, Daşkəndim.

Həsrətliklə gözləyirdik Novruzu,
Yumurtalar boyanardı qırmızı.
Bulaq üstdə sevərdi oğlan qızı,
Hörmə dəsmal, daraq idin, Daşkəndim.

Nişanlılar sayardılar hey günü,
Qara zurna səslənərdi yay günü.
Al-qırmızı bəzənərdin toy günü,
Hər havaya oynaq idin, Daşkəndim.

Papaq idi nənələrin dingəsi,
Kəmər idi gümüş pulun sikkəsi.
Pay paylardı bəy, gəlinin yengəsi,
Alqış deyən dodaq idin, Daşkəndim.

Zurnada Zamaxan, Mehvalı, Məcid,
Dünyamalı, Tapdıq, “Totulu” kilid.[1]
Ay Xıdır, Qəhrəman gücünü bərkit,
Zuy-zurna, dəf-çombaq idin, Daşkəndim.

[1] Totulu – Həsən adlı ən mahir nağaraçının ləqəbi

Şax[1] gələrdi qardaşağa[2] evindən,
Hay gələrdi çaparların dilindən.
Yer tapmazdın uşaqların əlindən,
Başdan-başa yığnaq idin, Daşkəndim.

Axşam-sabah mələdikcə qoyun, mal,
Orkestri bənzədirdi bu xoş hal.
Binaların, – təndir damı, – kəllə zal,
Aynabəndli otaq idin, Daşkəndim.

Başlanardı qışda dastan gecəsi,
Söylənərdi nağılların neçəsi.
Döyülərdi Ələkbərin keçəsi,
Naxış idin, saçaq idin, Daşkəndim.

Sazından, sözündən hamı halıydı,
Hacının avazı beçə balıydı.
Göyçə bir gözəlin ay camalıydı,
O camala yanaq idin, Daşkəndim.

Vətən dedi Alqayıt son nəfəsdə,
Çırpınırdı İman sənsiz qəfəsdə.
Həsən, Fəzi, Məmmədsöyün həvəsdə,
Sən bir qaynar bulaq idin, Daşkəndim.

[1] Şax – şirniyyat və meyvə ilə bəzədilmiş ağac
[2] Qardaşağa – bəyin sağdiş dostu

Tapdıq, Tanrıverdi, Namaz, Təvəkkül,
Yaqub haqdan memar idi elə bil.
Səxa əhli Lətif köç etdi qəfil,
Sən onlarla soraq idin, Daşkəndim.

Bir an unutmaram Səfxan müəllimi,
Bu yazıya o öyrədib əlimi.
Ruhum gəlib yoxlayacaq elimi,
Mənə doğma qucaq idin, Daşkəndim.

Əli Əziz oğlu təsifdə təkmiş,
Xasaylar[1] şeirlə hikmətlər əkmiş.
Əliyev Söyünlə, Hümbət çox demiş
Dinsizlərdən iraq idin, Daşkəndim.

Tat Süleyman danəndəydi söhbətdə,
Qız, gəlinlər mömün idi ismətdə.
Şəriətdə, təriqətdə, sənətdə,
Şölə saçan çıraq idin, Daşkəndim.

İnsanlıqda layiq idi bəyliyə,
Tavariş can atdı hər an eyliyə.
Ayrıc idin Sədərəyə, Zəyliyə,
Yolumuza mayaq idin, Daşkəndim.

İgidlərin şahı, xanı səndəydi,
Meydanların pəhləvanı səndəydi.
Seyid Bayram xanimanı səndəydi,
Məbəd idin, ocaq idin, Daşkəndim.

---

[1] Xasay Hacıyev və Xasay Zeynalov nəzərdə tutulur.

Hikmət idin sən ağıllı baş üçün,
Ümid idin gözdən axan yaş üçün.
Qurud, motal, yağ-bal idin qış üçün,
Kərmə, yappa, qalaq idin, Daşkəndim.

Yadımdadır babaların dediyi,
Tufan varsa açma keçid, gədiyi.
Qocaların xoşladığı, yediyi –
"Kətə çörək", quymaq idin, Daşkəndim.

Qorqud baba deyib sənin yaşını,
Şah Xətai öpüb torpaq, daşını.
Sən kəsmisən Selikovun başını,
Gavırlara qınaq idin, Daşkəndim.

Əvəzin yox idi halal zəhmətdə,
Sədi idin, Bəhlul idin hikmətdə.
Adın çəkilərdi hər xoş söhbətdə,
Könüllərə qonaq idin, Daşkəndim.

Tarixi varaqla baxaq keçmişə,
Keçmiş bizə dərs veribdi həmişə.
Hanı Hacı Rəhim dada yetişə,
İgidlərlə qoçaq idin, Daşkəndim.

Qafil olduq düz görmədik hədəfi,
Açammadıq düyün düşən kələfi.
Yaralıdı, səslə Aşıq Nəcəfi,
Erməniyə yasaq idin, Daşkəndim.

Sağ olsun İlhamı verdi mövzunu,
Əritdi qəlbimin həsrət buzunu.
Haqqa şükür tamamladım yazını,
Yazılmamış varaq idin, Daşkəndim.

Şiruyəyəm, ömrüm-günüm heyrətdə,
Həsrətinlə zillətdəyəm, zillətdə.
Ayılmadın, niyə yatdın qəflətdə,
Sən ki, hər vaxt oyaq idin, Daşkəndim?

***2014-cü il***

## DAŞKƏNDİM

Könlümü viran etmisən,
Könlü yaralı Daşkəndim.
Qaçqın, köçkün eli kimi,
Bəxti qaralı Daşkəndim.

Əhd elədik hər oynunda,
Əhdimiz qaldı boynunda.
Doğulduq sənin qoynunda,
Olduq haralı Daşkəndim?

Nur verən yox çırağına,
Əl atan yox bucağına.
Küsüb Seyid ocağına,
Gəlmir maralı, Daşkəndim.

Xanimanlar boş qalıbdı,
Ocaq sönüb, daş qalıbdı.
Yad sənə sirdaş qalıbdı,
Eldən aralı Daşkəndim.

Qoynundan bir daş gətirdim,
Təsəlli, sirdaş gətirdim,
Yanağımda yaş gətirdim,
Çəkdim zavalı, Daşkəndim.

Hər bucağın bir məbəddir,
Hər daşın bir ziyarətdir.
Yer üzündə bir cənnətdir,
Göyçə mahalı, Daşkəndim.

İlham alan sözdən, sazdan,
Xoş söhbətdən, xoş avazdan.
Hər ismətli gəlin, qızdan,
Üzü həyalı Daşkəndim.

Hüsnünü kim görsə əgər,
Sənə cənnət məkan deyər.
Qayası sərt, dağı ləngər,
Səngər, qalalı Daşkəndim.

Dururmu o səcdəgahlar?
O məbədlər, o ocaqlar?
Nəğmə deyirmi bulaqlar?
Zövqü-səfalı Daşkəndim.

Hanı, ərənlərin hanı?
Kim tutubdu o meydanı?
Şiruyənin nəfəs, canı,
Qəmi, məlalı Daşkəndim.

# ƏLİDƏN ALDI

***Xəlilov Əli Əziz oğluna***

Göz açıb dünyaya gəldiyi gündən,
Əli nüsrətini Əlidən aldı.[1]
Sığındı Tanrının mərhəmətinə,
Əli qeyrətini Əlidən aldı.

Dar gündə, gen gündə: ya Ağa – dedi,
Canım olsun sənə sadağa – dedi.
Çıxmaram haqq işdən qırağa – dedi,
Əli cürətini Əlidən aldı.

Şiruyə, – xoş baxdı haqq niyyətinə,
Saldı kəreminə, mərhəmətinə.
Nəsib oldu, getdi ziyarətinə,
Əli qismətini Əlidən aldı.

[1] İmam Əli nəzərdə tutulur.

# İLHAMIN

## *Xəlilov İlham Əli oğluna*

Göyçədən Bakıya gətirdiyi daş,
Təsəllisi, sirdaşıdı İlhamın.
Göyçə əbədilik əli üzülən,
Nurəlitək qardaşıdı İlhamın.

Xəyalları yol açdıqca o yerə,
Ah çəkib, of deyir gündə min kərə.
Çiçəkli dağ, güllü çəmən, gen dərə,
Gözlərində qəm yaşıdı İlhamın.

Şiruyə, ülfət qur, dərindən tanı,
Bu vətən qəmxarı olan insanı.
Qəlbində dolanan ümid-gümanı,
Həsrət, vüsal savaşıdı İlhamın.

***03.10.2014***

## APARDI NURƏLİ

***Mərhum Xəlilov Nurəli Əli oğlunun xatirəsinə***

Qəbir deyir – mən qaranlıq zülmətəm,
O zülmətə nur apardı Nurəli.
Qəbir deyir – yem gətirin acam mən,
Şirin nemət, bar apardı Nurəli.

Qəbir deyir – mən torpaqlar eviyəm,
Əqrəb, ilan mən tapdaqlar eviyəm.
Mən kasadlıq, mən soyuqlar eviyəm,
Xalça, xalı, var apardı Nurəli.

Diqqət verin siz qəbirin sözünə,
Səxavət istəyir alov-közünə.
Xeyirxah işiylə özü-özünə,
Bir rahatca yer apardı Nurəli.

Qəbrin istədiyi yaxşı əməldi,
Şiruyə, pak-ülvi, səxalı əldi.
O əməl-amalnan məzara gəldi,
Təmiz iman, sur apardı Nurəli.

***2014-cü il***

# MAHİRƏ BƏSDİ

***Xəlilov Mahir Əli oğluna***

Demirəm bəy olsun, bəyzadə olsun,
Təkcə xoş ülfəti Mahirə bəsdi.
Elə məhəbbəti, haqqa inamı,
Dosta sədaqəti Mahirə bəsdi.

Əsil insanlığın xanıdır, xanı,
Alqışa bürünür gəzsə hayanı.
Pak olan nəfisi, təmiz vicdanı,
Xalqa məhəbbəti Mahirə bəsdi.

Şiruyə, eylikdir hər an adəti,
Amalı bədliyə uyuşmaz qəti.
Heç zaman kəsilməz haqdan qisməti,
Halalca qisməti Mahirə bəsdi.

***03.10.2014***
***Bərdə***

***Anam Göyçə, bir mayaqsan,***
***Sən dağların zirvəsində.***
***Göyçə özü bir zirvədir –***
***Öyünməynən zirvə, sən də!***

## PROLOQ

Anam Göyçə, ayağına sürünüb,
Yenə sənlə görüşməyə gəlmişəm.
Xəyaldımı, yuxudumu bilmirəm,
Qucaqlaşıb, öpüşməyə gəlmişəm

Hər anımda səni deyib anmışam,
Həsrətinlə alovlanıb yanmışam!
Vüsalın eşqiylə qanadlanmışam,
Küləyinlə ötüşməyə gəlmişəm

Əfsanə deyildi arzu, diləyim,
Sənsən ümid yerim, darda gərəyim.
Həsrətindən çat veribdi ürəyim,
Məlhəm umub bitişməyə gəlmişəm.

Bulaqların buz suyundan içib hey,
Pencərini dişim ilə biçib hey.
Sərt, sıldırım cığırlardan keçib hey,
Qayalarla didişməyə gəlmişəm.

Qaçıb "Yataq" yolu kaş düşəm heydən,
Yay vədəsi qar gətirəm quzeydən.
"Dəmyə", "Ayrımdərə", "Uzun Güney"dən,
Üzaşağı sürüşməyə gəlmişəm.

Dost-qohumdan xoş bir ülfət götürüb,
Pak ləyaqət, gözəl adət götürüb.
Qocalardan bir nəsihət götürüb,
Cavanlarla gülüşməyə gəlmişəm.

Xəstəyəm, könlümün ümid, imdadı:
Bir Allah, bir ana, bir Göyçə adı!
Sənsən Şiruyənin yenə ustadı,
Elm öyrənib, yetişməyə gəlmişəm.

Sərraf Göyçəni dedim,
Dağıt göy, – çəni dedim,
Hər kəs öz sevgisini –
Məndə Göyçəni dedim.

Sərraf göyçəməndədi,
Qonub, göy, çəməndədi.
A Göyçə həsrətlilər –
Gəlin, Göyçə məndədi.

Həyatdan bir səs gəldi,
Səs gəldi, nəfəs gəldi.
Ey İlahi, görəsən –
Niyə belə nəs gəldi?!

O gümansız bir səsdi,
O inamsız bir səsdi.
O haqqa inanmayan,
O imansız bir səsdi.

Ümidsiz bir şeytandı,
O da şərdi, böhtandı.

Yaranmış hər bir bəşər,
Ümid ilə əlləşər.

Qəlbini, ürəyini,
Hər arzu diləyini.

Bir Allaha bağlayar,
Xoş sabaha bağlayar.

Görək nə deyir bu səs,
O bəd fikir, bəd nəfəs:

– Düşkün qoca, müstər qoca,
Nə xəyaldı düşmüsən sən?
Bilmədiyin, açmadığın,
Nə sualdı düşmüsən sən?
Bu çəkdiyin nə qüssədi,
Nə məlaldı düşmüsən sən?
Çətin yola yolçu olmaq,
Səyyah olmaq istəyirsən.

Yoxsa təzdən cavanlaşıb,
Bir şah olmaq istəyirsən?

Gözündə nur, qolunda güc,
Dizində təpər qalmayıb.
Axtardığın cavanlıqdan,
Səndə bir hünər qalmayıb.
Fikrində də, zəkanda da,
Hikmət o qədər qalmayıb.
Hansı ümid, güman səni,
Bu xəyala bağlayıbdı?
Bu səfərin eşqi ilə,
Könül coşub çağlayıbdı?

Bilmirsənmi bu mənzilin!
Enişi var, yoxuşu var.
Başım üstdən ildırımın,
Qəfil yerdən çaxışı var.
Qasırğası, tufanı var,
Dolusu var, yağışı var.
Düşkün qoca deyilənə,
Canda dözüm varmı səndə?
Yoxsa ömrün düşkünlüyü,
Təzdən bir baharmı səndə?

Dedim: dayan, ey sualçı,
Cahil insan, fikri dayaz.
Get, elm öyrən, kamillik tap,
Bu həyatda sən də bir az.

İlahinin güc-qüdrəti,
Bilmirsənmi deyildir az.
Mən o qüdrət sahibinin,
Ətəyindən yapışmışam.
O eşq ilə bu xəyaldan,
Bu məqsəddən yapışmışam.
Ümidim də, gümanım da,
Bir olan Allahdı ancaq.
Varlığıma, vücuduma,
O şəriksiz şahdı ancaq.
Dar günümdə, gen günümdə,
O mənə pənahdı ancaq.
Ondan nicat, ondan nüsrət,
Ondan təpər diləyirəm.
Yol-yoldaşım odur ancaq,
Ondan hünər diləyirəm!

O gözümə nur verəcək,
Dizimə təpər verəcək.
Qələmimə güc verəcək,
Sözümə şəkər verəcək.
Qoymayacaq darda məni,
Hər şeyi yetər verəcək.
Enişim də, yoxuşum da,
Mənə düzən olacaqdı.
Yollarımda nə bir duman,
Nədə ki, çən olacaqdı.

Əyyubun yaralarına,
O qüdrətdən məlhəm gəldi.
Yaqub yetişdi vüsala,
Ortalığa bir dəm gəldi.
Züleyxa yetdi gəncliyə,
O, Yusifə həmdəm gəldi.
Musanı xilas eyləyib,
Fironu dəryaya saldı.
Nəmrudları, Şəddadları,
Necə ağır vaya saldı.

– Budur indi qulağıma,
Bir xoş səda gəldi yenə.
Dedi: – Tanrı hər arzunu,
İstəyini bildi yenə.
“Bismillah” de, çıx səfərə,
Bəxt üzünə güldü yenə.
İlahinin xoş nəzəri,
Hər an sənlə olacaqdı.
Hər dediyin hikmətli söz,
Könülləri alacaqdı.

# I
# GÖYÇƏ İLƏ DƏRDLƏŞMƏ

Anam Göyçə, mən dərdimi söylədim,
Gəlişindən səni halı eylədim.
Xəyal köhlənimi yordum, teylədim,
Köhlənim də sənə tutdu üzünü,
Bir nişan ver mənə təzdən özünü.

Anam Göyçə, tarixinə əl atdım,
Neçə-neçə əsrlərə say atdım,
Onilliklər, minilliklər oyatdım,
Dilə gəldi daşlardakı izlərin,
Kimlər görüb, nələr görüb gözlərin.

Sən olmusan əhli-beytin məskəni,
Məkkə billəm, Kəbə billəm mən səni.
Söylə bizə babalarımız deyəni,
İmamların əl izi var daşında,
Tarix yatır yaddaşında, yaşında.

***İmam burda at sürmüş,***
***Daşlarında izi var.***
***Miskin Abdal ocağı,***
***Ocağının közü var.***

***Şeyx Heydərim bəyənmiş,***
***Bura müsafir gəlmiş.***
***Hüsnünə gözəl demiş,***
***Dilə gələn sözü var.***

***Hər gələn sevdi yurdu,***
***Dostluq xanəsi qurdu.***
***Ayrılıq çatdı, durdu,***
***İndi ağlar gözü var.***

Nədən deyir, nələr deyir bu üzlər,
O üzləri görən səni əzizlər.
Qoynundakı dağlar, daşlar bu düzlər,
Xəbər verir bizə Həzrət Əlidən,
Peyğəmbərin canişini Vəlidən.

Mədinədən tutmuş ta Çinə qədər,
Şəhri-Zərin sirli içinə qədər.
Salsalın axirət köçünə qədər,
Həzrət Əli burda döyüş aparmış,
Tanrı hər izini daşa salarmış.

Daşlara düşərmiş ayaq, əl, izi,
O Allahın sevimlisi, əzizi.
Möcüzə önündə qoyubdu bizi,
"Düldül" atın ayaq izi daşdadı,
Bu məbədlər başımızdan başdadı.

Beşdi, ondu qoynundakı bu sirlər,
Keçib neçə qərinələr, əsrlər.
Sonra gəlib Dədə Qorqud deyirlər,
O da sənə "gözəl", "göyçək" deyibdi,
Sabahına xoş gələcək deyibdi.

“Ocaqlı dağı”nda daş nənni də var,
İmamın vaxtından qalıb yadigar.
Kim ziyarət edib, övlad arzular,
Haqq əmriylə yırğalanır o nənni,
Gərək anlayasan nənni deyəni.

Şeyx Heydərim qonaq gəlib qoynuna,
Şah Xətai qol dolayıb boynuna.
Alqış deyib Miskin Abdal soyuna,
Ocağının daşlarından öpübdü,
Torpağından öz üstünə səpibdi.

O ocaqlar neçə nəsil yetirib,
Kökə, soya neçə əsil yetirib.
Haqqa dönən neçə oğul yetirib,
Dastanlaşıb ərənləri, ərləri,
Seyidləri, şairləri, pirləri.

Böyük Ağa, Səməd ağa, neçəsi,
Mümkün deyil adlarından keçəsi.
Çalışıram gedəmmirəm kəsəsi,
Anam Göyçə, keçmişlərdən sən danış,
Yaddaşlarda qalmışlardan sən danış.

Hacı Rəhim igidlikdə Qazan xan,
O olubdur yağı başı üzən xan!
Məşədi İsə siyasətlə gəzən xan,
Ziyad, Qasım neçələri yaddadı,
Əsgəranda yağı bağrın oddadı.

O ərlərdən, ərənlərdən yazıblar,
Seyidlərdən, o pirlərdən yazıblar.
Neçə-neçə hünərlərdən yazıblar,
Mən yazacam bir xeyirxah ocaqdan.
Xeyirxahlıq heç düşməsin dodaqdan.

***İnsan bu dünyanın əşrəfi olar,***
***Vicdan təmiz ola, can sağlam ola.***
***Nə şeytan, nə iblis güc gələ bilməz,***
***Mühit sağlam ola, an sağlam ola.***

***Hər haya, haraya gəlməyə nə var,***
***Hər şeyi öyrənib, bilməyə nə var,***
***Dağları, daşları dəlməyə nə var,***
***Tale üzə gülə, can sağlam ola.***

***Hər şey düz olarsa gör nələr olmaz,***
***Bir ürək qəmlənməz, qəlb mələr olmaz.***
***Zərrəcə haqq işə şübhələr olmaz,***
***İslam dini kimi din sağlam ola.***

# II
# DAŞKƏND KƏNDİNİN TƏSVİRİ

Otuz yeddi kənd idi,
Göyçənin şərq tərəfi.[1]
Hər kənd könül oxşayan,
Mənzərəli, səfalı.
Ətrafı uca dağlı,
Ətəyi gen dərəli.
Zirvələrə gedən yol,
Tamam bəndli-bərəli.
Daşkənd kəndi ucqarda,
Yerləşən bir kənd idi.
Bu kənd qayalıqlarla,
Elə bil "peyvənd" idi.
Elə sanırdın ki, kənd,
İki mərtəbəlidi.
Bu sütunları qoyan,
Ancaq haqqın əlidi.
Silsilə qayalıqlar,
Kənd boyu uzanırdı.
"Gözlülər" məhləsinə,
Az qalmış dayanırdı.
Yuxarıdan "Qəfərli"yə,
Taki gedib çıxırdı.
Orda "Taxçalı qaya",
Kəndə doğru baxırdı.
Qayalıqlar altında,

---

[1] Basarkeçər rayonunun ərazisi nəzərdə tutulur.

Yeddi mağara vardı.
Hər birisi min başdan,
Çox mal-heyvan tutardı.
Payız, qışda sürülər,
Burda saxlanılardı.
Mağaranın qapısı,
Həm bacası olardı.
Zağa deyirdi hamı,
Həmən mağaralara.
Hətta ki, ayrı-ayrı,
Ad vermişdi onlara.
“Binnət”, “Sultan”, “Məhəmməd”
“Qocamanın zağası”.
“Sulu zağa”nın ancaq,
Çox olurdu xatası.
Deyirlər orda çoxlu,
Cin-şəyirtin olardı.
Kimisə aldadaraq,
Zağaya aparardı.
Sulu Zağaya hardan,
Su dolur bilinmirdi.
Nə qədər axtarılsa,
Bir axar görünmürdü.
Beləcə qaya altı,
Qaya üstü kənd idi.
Qayalıqla bu evlər,
Bir-birinə bənd idi.
Qayalığın üstündə,
Bir-birindən aralı.
Birinin divarları,

Tamam sökük, paralı.
İki Alban kilsəsi,
Həm məzarıstan vardı.
Keçmişdən gələcəyə,
Bu bir sübut, tutardı.
Başdaşları sanırsan,
Elə bu gün qoyulub.
Üstündəki naxışlar,
Ustalıqla oyulub.
On ikinci əsrə,
Aid olan kilsələr.
Sökülsə də qalacaq,
Tarix kimi çox illər.
Şərqdən Şorca kəndləri,
Cənubdan "Dik pilləkən".
Yayda yaylaq axtaran,
Buranı edir məskən.
Sarıyaqub, Qoşabulaq,
Şimal sərhəddi idi.
Mərkəzlə Daşkənd yolu,
Çox rahat bir yol idi.
Səkkiz kilometr yol,
Cermuxa bir qol idi.
Cermux istisuyuna[1]
Uzanırdı bu qolu.
Bura birləşdirirdi,
Ora gedən hər yolu.
Daşkəndin ərazisi,

[1] İndiki Ermənistanın isti suyu.

Böyük idi hər kənddən.
Çoxunun su axını,
Ayrılırdı bu bənddən.
Sayılıb seçilirdi,
Daşkənd bütün kəndlərdən.
Üzüağ, başı uca,
Çıxardı hər hünərdən.
Savadlı adamları,
Ərənləri var idi.
Dizləri qatlanmayan,
Çox ərləri var idi.
Bax belə təsvir edir,
O elin şairləri.
Təsviri təsdiq edir,
Aqilləri, pirləri.

Dağlar, daşlar yas saxlayır İdrisə,
Min rəhmət yaxşıya, min lənət pisə.
Qoç Alı dağıdıb çox səngər, kilsə
Qanlılı Qurbanın izi bəs hanı?

Mehralı oğlu Məmməd qan-qan deyibdi,
Ziyada çox ellər qurban deyibdi.
Həvil Qasım "getdim zindan" deyibdi,
Kəvərdən Qanlıya izi bəs hanı.

Hacı Rəhim – Rüstəmi-Zal, Cahangir
Tədbirdə pir Qorqud, döyüşdə bir şir.
Hünəri elm ilə olubdu əlbir,
Xəncərinin iti üzü bəs hanı?

Erməni Çaxırlıya gəlib, dolduğu zaman,
Seyid Bayram Daşkəndi özünə seçmiş məkan.

Daşkənddə yuva saldı, o Daşkənddə yaşadı,
Adı hər bir ürəkdə möminlərlə qoşadı.

Yüz igidin içində xəncərini sıyıran,
Selikovun başını, bədənindən ayıran.

Cəsarətdə, cürətdə pir olan Hacı Rəhim,
İgidlərin dizinə gir olan Hacı Rəhim.

Daşkəndin sakiniydi, Daşkəndin əreniydi,
Elin vuran sağ əli, sabahı göreniydi.

Çox mənəm deyənləri salıb tilov, tələyə,
Selikov can vermişdi Nikolay – deyə-deyə.

"Arpa-arpa" deyərmiş, atlara arpa yığmaq,
Nikolayın əmriylə müsəlmanı talamaq.

Damlası torpaqda qalsa göyərər,
Qazıyıb itlərə atın bu qanı!
Qulağı kəsilmiş Andranikin,
Qəbir torpağına qatın bu qanı!

Çox uzun çəkəcək hələ bu oyun,
Köməyə çağırır havarın, hoyun.
Üstünə bir eşşək dırnağı qoyun,
Kəvər keşişinə satın bu qanı!

Min fitnə var, min fəsad var bu qanda,
Əməlləri tor qurubdu hər yanda.
Hacı Rəhiməm, qoyun yaxşı sapanda,
İngilis tərəfə atın bu qanı!

Millət satqınlarımız,
Hacını tanıtdılar.
Selikovun qanını,
Ermənilər aldılar.
Elin gözü önündə,
Şəhid oldu Hacı Rəhim.
Ancaq ki, igidliyə,
Bir yol saldı Hacı Rəhim.
Oğlu Əsədullah da,
Şəhid oldu bu yolda.
Dillər əzbəri oldu,
Hər ikisi mahalda.
Bu sözləri deməyə,
Var sübutum, əsasım.
Kəndə pənahdarıydı,
İgid Məşədi Qasım.
Onun silahdaşları,
Neçə-neçə igidlər.
Ziyad, Qara İdristək,
Cəsarətli, hünərvər.
"Rzallı" tirəsindən,
Abbasəli pəhləvan.
Güləş meydanlarında,

Qalib idi hər zaman.
Hacı Balı kəndinin,
Təsivini çəkərdi.
El üçün, oba üçün,
Əlbir olun deyərdi.
Sözü qılıncdan iti,
Ağsaqqallar var idi.
Kəndin xeyir-şərinə,
Onlar ixtiyar idi.
Ələsgərin sevimli,
Şəyirdi Aşıq Nəcəf.
Öz sazı, öz sözüylə,
Olmuşdu əziz xələf.
Bütün Qafqaz elində,
Sevilirdi bu ozan.
Yaman bəd yazmış idi,
Bəxt, iqbal yazı yazan.
Beş oğulu, həm özü,
Arvadı, gəlinləri.
Şişqayada oldular,
Erməni əsirləri.
Beş oğlunu diriykən,
Torpağa basdırdılar.
Özgə əsirləri də,
Bu zülmlə qırdılar.
Nəcəfin sazın qırıb,
Samovar qaladılar.
Samovarı Nəcəfin,
Belinə bağladılar.

Tarixi dastanlarda,
Təsvir olub bu sitəm.
Nəcəfin son sözləri,
Dildə oxunur müdəm:

***Könül quşu, uç get vətən elinə,***
***Mənə o ellərdən bir xəbər gətir.***
***Yetir əhvalımı nər igidlərə,***
***Qasımı, Ziyadı birtəhər gətir.***

***Görsən nalə çəkir oğulsuz ana,***
***Deginən – ömürü getdi bədfana.***
***Qoy düşmən gülləsi dəyməsin mana,***
***İçməyə vətəndən bir zəhər gətir.***

***Nəcəf bilmir harda qaldı Gülüstan,***
***Şəmiddin, Şəmistan, Mikayıl, Astan.***
***İsmayıl körpəydi, çıxammaz yasdan,***
***Xudam, sən üzünə xoş səhər gətir.***

Sonra da bir bayatı,
Demişdi son nəfəsdə.
Nə qədər ah-fəqan var,
Bu deyimdə, bu səsdə.

El gəlsin an üstəyəm,
Gedirəm kam üstəyəm.
Nə çəkilməz dərddi bu:
Yaram yox, can üstəyəm.

Bax bu Aşıq Nəcəfdə,
Daşkənd elindən idi.
Bu dediyim sözlərsə,
Onun dilindən idi.
Adı, ünvanı, yeri,
Tarixlərə həkk olmuş.
Şair Məmmədhüseyn,
Həmən bu kənddən olmuş.
Zərbi məsələ dönmüş,
Bir şeirini deməsək.
Bizləri bağışlamaz,
Bu yer, bu göy, bu fələk.

***Yönü bəri duran dağlar,***
***Yatıb oyanmaz, oyanmaz.***
***Üstündəki ağır ellər,***
***Yatıb oyanmaz, oyanmaz.***

***Gəldim yarın xanasına,***
***Laçın qonmaz binəsinə.***
***Əlim qoydum sinəsinə,***
***Yatıb oyanmaz, oyanmaz.***

***Qurbanam qələm-qaşına,***
***Gör nələr gəldi başıma.***
***Səs verrəm dostum guşuna,***
***Yatıb oyanmaz, oyanmaz.***

***Yarım yaman yatmış idi,***
***Müşk-ənbərə batmış idi.***
***Ürbəndini atmış idi,***
***Yatıb oyanmaz, oyanmaz.***

***İgidin dönməsin əhdi,***
***Yana çevrilməsin təxti.***
***Məmmədhüseynin qara bəxti,***
***Yatıb oyanmaz, oyanmaz.***

Oxucum, əvvəl sənlə,
Bir ixtilaf etmişdim.
Mən sadə bir ocaqdan,
Söz açacam demişdim.
İndiyədək saydığım,
Elnən tanışlıq idi.
Uzun-uzadı söhbət,
Bəlkə yalnışlıq idi.
Çox kişilər var idi,
Adları yazılmalı.
Hünərləri tarixdə,
Yaddaşlarda qalmalı.
Məndən sonra gələnlər,
Yazacaqdı bunları.
Söyləyəcək zamanın,
Açdığı oyunları.
Mən mətləbə qayıdıb,
Mən məqsədə gəlirəm.
Mənzil uzaq, vaxtım dar,
Bunu yaxşı bilirəm.

## III
## DAŞKƏNDLİ QARA ƏZİZ

İndi söhbət açaq Qara Əzizdən,
Qara görünərdi sifətdən, üzdən.

Ona görə "qara" ləqəbi vardı,
Mən görəndə yetmiş yaşı olardı.

Nazik, uzun, qara sifət kişiydi,
Mal-qoyuna ələf vermək işiydi.

Ağacdan hörülmə səbəti vardı,
Səbəti bir çuval saman tutardı.

O səbətlə daşıyardı samanı,
Mal-heyvanın qışa oydu gümanı.

Arpa, buğda küləşini vəl ilə,
Əzib, sonra sovuraraq əl ilə.

Taxılı, samanı ayırardılar,
"Kəndi"ni taxılnan doldurardılar.[1]

Taxtadan düzəlmiş çən idi kəndi,
İçindəki ya un, dən idi kəndi.

---

[1] Kəndi – taxıl, un qabı.

Hər evin özünün kəndisi vardı,
Kəndi hər ev üçün ölçü olardı.

İllik çörək idi bir dolu kəndi,
İli başa vuracağam deyəndi.

Saman samanlıqda olardı ancaq,
Samanlıq da tamam dolardı ancaq.

Ot tayası yığılardı bir ayrı,
Bu idi Göyçənin qışa tutarı.

Yappa, kərmə qalaqları olardı,
Köhnə ildən təzə ilə qalardı.

Belə təsvir verib Aşıq Ələsgər,
O gözəl deyimi unudaq məgər?

***“Arvadlar ki, əlin vurar qalağa,***
***Yuyarlar, gün vurar, çıxardar sağa.”***

Yağ, şor, qurud soyuqluqda olardı,
Bir tərəfi əvəliklə dolardı.[1]

Divarlardan asılardı ələyəz,
Hər çiçək, otuna yox idi əvəz.

[1] Qırxbuğumkimilər fəsiləsinə aid bitki cinsi.

Hər evə bir illik ehtiyat buydu,
Bir də kartof dolu neçə quyuydu.

Toplamışdı Əziz kişi bunları,
Var idi tövlədə mal-qoyunları.

Heç bir şeyə ehtiyacı yox idi,
Ancaq fikri, dərdi yaman çox idi.

Yerişi, duruşu tamam qəm idi,
Gözləri də xəlvət-xəlvət nəm idi.

Bəzən səbətini yerə qoyardı,
Bir daşın üstündə o oturardı.

Əli çənəsində fikrə gedərdi,
Gah Niftalı, gah da Əli deyərdi.

Niftalı döyüşdən geri dönməmiş,
Öldüdən, qaldıdan xəbər gəlməmiş.

Geri qayıtmışdı salamat qalan,
Niftalıdan zərrə xəbərdar olan.

Bir nəfər yox idi, verə təsəlli,
Əsgəri xidmətə getmişdi Əli.

Kişini üzürdü bir də bu həsrət,
Zar-zar ağlayırdı kişi nəhayət.

Özünü yetirib hey Reyhan arvad,
Deyirdi, – A kişi, nədi bu fəryad?

Beş ildən sonra qayıtdı Həsən,
Alçalı Mirzəni görmədinmi sən?

Bir il bundan qabaq geri qayıtdı,
Qəmli fikirləri qəmdən ayıltdı.

Bir gün də Niftalı gəlib çıxacaq,
Bu həsrəti, bu hicranı yıxacaq.

O ki, qaldı Əli, – şükür Allaha,
Xidməti yarıya yetirib daha.

Ta üç il nədir ki, gəlib keçəcək,
Bu dərd, kədər ürəyindən gedəcək.

Qaldı Şəkər dərdi, Mahı dərdinə,
Ay kişi, dünyanı dərk eylə yenə.

Hanı atan Xəlil, hanı Rza Alı?
O Rza Qocanın cahı-cəlalı?

Hanı Hacı Kərim, bəs hanı Mədət?
Onların hamsına olsun min rəhmət!

Kimi cavan gedir, kimi də yaşlı,
Bu dünya belədir, ay başı daşlı.

Bəs Mədət neyləsin tək oğlu getdi,
Toy üstə axirət evinə yetdi.

Sən Mahı dərdinə dözə bilmirsən,
Qızım, qızım – deyib hey inləyirsən.

Mahı da Şəkərtək tez açdı-soldu,
Ömür yolları da çox uyğun oldu.

Şükür ki, Şəkərdən qalıb Niftalı,
Mahıdan nə qaldı? Ancaq məlalı!

Ancaq ki, bu tədbir haqq tədbiridi,
Qızımız da gedənlərin biridi.

Allah səkkiz uşaq veribdi sənə,
Birini aparıb haqqın evinə.

Bu qədər qəm çəkib, ah-nalə etmə,
Belə dərin-dərin fikirə getmə:

– Sağ ol, Reyhan arvad, sağ ol, ay ana,
İnsanlıq gərəkdir səni duyana.

Hərismət, ləyaqət yaraşır sənə,
Sən əsil layiqsən Tanrı deyənə!

Fatimeyi, Xədiceyi Kübraya,
Tanrıya sığınan xanım Asyaya.

Yeridir söhbətdən çıxım kənara,
Bir şeir söyləyim mən oxuculara:

***Ağılı, kamalı, ləyaqətiylə,***
***Kişini şöhrətə mindirər qadın.***
***Olar sevincinə, dərdinə şərik,***
***Oxşayar qəlbini dindirər qadın.***

***Ərə sirdaş olar, mehriban olar,***
***Dar günə təsəlli, xoş güman olar,***
***Can deyər ərinə, can uman olar,***
***Bir ümid işığı yandırar qadın.***

***Qadın var, Tanrıya o pənah eylər,***
***Qadın var, bir gündə yüz günah eylər,***
***İstəsə ərini şahənşah eylər,***
***İstəsə ərini sındırar qadın.***

## IV
## REYHAN ANA

Xəstə yatağına düşəndən Şəkər,
İztirab çəkirdi Əziz nə qədər.

Elə həmən gündən Əziz vaydaydı,
Bir yaşlı Niftalı qapılardaydı.

Onu aparmışdı bibisi Simi,[1]
Onu oxşasa da balası kimi.

Ancaq dözəmmirdi Əziz həsrətə,
Toğlucaya üz tuturdu çox vədə.

Siminin evləri Toğlucadaydı,
Ora isə yarım günlük yoldaydı.

Gözəl bibiləri – Zeynəblə Şirin,
Köməkdarı oldu həmən günlərin.

Gətirib Daşkənddə onlar baxdılar,
Gah bu, gah o sinəsinə sıxdılar.

Şəkərin ölmündən üç ay keçmişdi,
Hüseyn[2] Orucun yanına getmişdi.

---

[1] Əsl adı Simuzər
[2] Kərimov Hüseyn Rəsul oğlu

Oruc Əziz ilə qardaş idilər,
Çox istəkli can bir sirdaş idilər.

Orucun da qara ləqəbi vardı,
Oxşarda Əzizlə eyni olardı.

Hüseyn Şəkərin qardaşı idi,
Bu yas Hüseynin öz yası idi.

Oruca söylədi Hüseyn kişi:
Hamıya məlumdu dünyanın işi.

Gedən geri dönməz bunu bilirik,
Nə var çətinliyi yaxşı görürük.

İndi Niftalıya ana gərəkdi,
Ana övladına yanan ürəkdi.

Gətirin o evə bir yaxşı qadın,
Qoy qazana bilsin analıq adın.

Oruc bu işləri ələdi, süzdü,
Deyilən mətləbi axır ki, düzdü.

Şorcalı qızıydı Reyhan arvad,
Atası Abdulla, ruhu olsun şad.

Xəlillə Abdulla köhnə dost olmuş,
Dostluq ilqarında hər biri durmuş.

Gətirdi bu evə onun qızını,
Reyhan çəkdi Niftalının nazını.

Bir yol “of” demədi Reyhan arvad,
Hər zaman Əzizə o oldu imdad.

Aralıqdan gəlib keçdi çox illər,
Soluxub dən oldu tər qönçə güllər.

Reyhanda düşkünlük yaşına doldu,
Üç oğlun, üç qızın anası oldu.

Niftalıya ana oldu bax Reyhan,
Gözündən kənara qoymadı bir an.

Balaları Sübə, Əli, Köçəri,
Sənəm, Məsim, Maquş[1] altı nəfəri.

Niftalıdan o aşağı tutmuşdu,
Ögeylik adını tam unutmuşdu.

Ögeylik, doğmalıq heç bilinməzdi,
Bu söz ortalığa əsla gəlməzdi.

Niftalı döyüşə getdiyi zaman,
Reyhan ağlayıb çəkmişdi aman.

Dizini qatlayıb, əlini açmış,
Duası yeddi qat göyü dolaşmış.

[1] Məhluqə

***Hənnana tapşırıram,***
***Mənnana tapşırıram.***
***Oğlum döyüşə gedir,***
***Sübhana tapşırıram.***[1]

Reyhanın bu səsi, onun titrək nəfəsi,
Ürəkləri dağladı, hamı həzin ağladı.

Əzəldən bir kövrəklik vardı onun səsində,
Həyəcan duyulurdu hər adi kəlməsində.

Bu həzinlik səsində indi daha çox idi,
Hər deyişi qəlbləri deşib gedən ox idi.

– Bu da bir yanıqlı səs, bacıların səsidir,
Sübənin can yandıran yanıqlı nəfəsidir.

***Haqdan xoş fərman olsun,***
***Dərd varsa, dərman olsun.***
***Qardaşlar gələn yola,***
***Bacılar qurban olsun.***

Beləcə Niftalını yola salmışdı ata,
Üçkünclü bircə məktub ondan almışdı ata.

O məktubu təsəlli bilirdi öz-özünə,
Bir gündə neçə dəfə sürtürdü üz-gözünə.

[1] Hənnan, Mənnan və Sübhan Allahın adlarıdır.

## V
## ƏLİ ƏSGƏRİ XİDMƏTDƏN QAYIDIR

Əsgəri xidmətdən qayıtdı Əli,
Ümid gümanının ilki, əzəli –

Çox gözəl nəticə vermişdi onun,
Üç illik xidmətdə hər hərbi qanun.

Hər hərbi göstəriş, hər hərbi gediş,
Olmuş Əli üçün müqəddəs bir iş.

Böyük Çavuş rütbəsi almışdı,
Qələbəyə doğru bir yol salmışdı.

Fəallıq göstərmiş siyasi dərsdə,
Olmuşdu həmişə böyük həvəsdə.

Hərbi hissə onu namizəd vermiş,
Partiyaya layiq bir əsgər görmüş.

Üzv olmuş kommunist partiyasına,
Əməl etmiş onun hər əsasına.

Belə qayıtmışdı Əli hərbidən,
Böyük nümunəydi o yerbə-yerdən.

Alqışa bürümüş komissar onu,
Belə qutarmışdı alqışın sonu.

Hərbi müəllim getsin doğma məktəbə,
Müəllimlik yaraşır ancaq bu təbə.

Daşkənd məktəbində o, müəllim oldu,
Onu alqışlayan çox elim oldu.

Sarıyaqub, Şorcalar, həm Qoşabulaq,
Qayabaşından da gələn çox uşaq.

Daşkənd orta məktəbinə gələrdi,
Bu məktəbi hamı məbəd bilərdi.

Ələkbər Həsənli, Mirkəbir, Mədət,
Tapdıq, Tanrıverdi, Səmədov Səməd.

Çox yüksək savada elmə maliklər,
Namaz, Səfxan kimi kamil müəllimlər.

Bu orta məktəbdə dərs aparırdı,
Şagirdlər onlardan təlim alırdı.

Onlardan çox kiçik olsa da Əli,
İşindən çox güclü tutmuşdu əli.

Böyük alqışlarla keçdi ilk dərsi,
Şagirdlərdə o yaratdı həvəsi.

Stalinin heykəlinin önündə,
“Qalib marşı” hər əsgərin dilində.

Hərbi gedişləri öyrənirdilər,
Əsgəri borcuna and içirdilər.

***Ey vətən, müsəlləh əsgərinəm mən,***
***Ən ağır səfərə mən getməliyəm!***
***Məni böyütmüsən bir igid kimi,***
***Döyüşə, səngərə mən getməliyəm!***

***Yağı yuvasını yandırmaq üçün,***
***Düşmən həmləsini sındırmaq üçün,***
***Sənin bayrağını qaldırmaq üçün,***
***Hər səmtə, hər yerə mən getməliyəm!***

***Qoy qanım yolunda tökülsün yerə,***
***Qovuşum müqəddəs o şəhidlərə.***
***Ey vətən, səninlə xoş müjdələrə,***
***Hər aydın səhərə mən getməliyəm!***

Bir azca təsəlli tapmışdı ata,
Ümidlə baxırdı indi həyata.

Eldən eşitdikcə Əlinin adın,
Başını dikəldib Reyhan qadın.

Şükürlər edirdi uca Tanrıya,
Bir xoş xəbəri də qat bu haraya.

Niftalı da gəlsin, qəlblər sevinsin,
Qurbanlar kəsilsin, aşıqlar dinsin.

Bircə Mahı dərdi bəs edər bizə,
Təsəlli versək də öz-özümüzə.

Mahı dərdi bizimlədi həmişə,
Olub ürəyimiz çat vermiş şüşə.

Sınıb, töküləcək nə vaxtsa bu çat,
Elə əzəlindən belədir həyat.

Dünənki canlını bu gün öldürür,
Dünya öz yolunu belə bildirir.

Mahı da Tapdığı sevib, seçmişdi,
Xeyir-dua ilə gəlin köçmüşdü.

Belə gənc çağında əcəl haqlamış,
Əzizin ürəyi yara bağlamış.

Əvvəl Şəkər dərdi, sonra da Mahı,
Bu yazıq kişinin nəymiş günahı?

Bu ki, mərdiməzar işlər görməmiş,
Bir nəfərin xatirinə dəyməmiş.

Həmişə xeyirxax işlər görmüşdür,
Əl açıb, diz çöküb şükür demişdir.

Bir salavat verib Reyhan arvad,
Cəddi Peyğəmbəri o eylədi yad.

# VI
# ƏZİZ KİŞİNİN VƏFATI

Ömür bir axar çaydır,
Axar, geri qayıtmaz,
Ömür bir ildırımdır,
Çaxar, geri qayıtmaz.

Ömür əsən küləkdir,
Əsər, geri qayıtmaz.
Ömür susan ürəkdi,
Susar geri qayıtmaz.

Bir axar çaya dönüb,
Axdı Əzizin ömrü.
Döndü bir ildırıma,
Çaxdı Əzizin ömrü.

Bir əsən külək olub,
Əsdi Əzizin ömrü.
Döyünən ürək idi,
Susdu Əzizin ömrü.

Göyçə göyçəkləşir yazın son ayı,
Gəlir İlahinin gül-çiçək payı.

Yuyur ləçəkləri gecənin şehi,
Min ətir gətirir səhərin mehi.

Süsən, novruzgülü, lilpar, bənövşə,
Elə qonaq gələr ilkin həmişə.

Sonra lalə, nərgiz, qaymaqçiçəyi,
Bütün çiçəklərin gözəl göyçəyi.

Səpir ətirini tamam dörd yana,
Az qalır ki, ölülər də oyana.

Belə bir gündüzün axşam çağında,
Əziz vəfat etdi öz yatağında.

Son anda üzünü tutmuş Reyhana:
Hardadı gətirin o son nişana.

Reyhan gəlinə etdi işarə,
Niftalının məktubunu gətirə.

Sumaya bu evə gəlin gəlmişdi,
O Əlini, Əli onu sevmişdi.

Oxucum, bu haqda açacam söhbət,
Zərrəcə sıxmasın səni bu möhnət.

Əziz görən kimi üçkünc məktubu,
Dedi intizarım elə budu, bu!

Beləcə canını Əziz tapşırdı,
Arzu, istəyinə bir kilid vurdu.

Dayandı atanın həsrət ürəyi,
Əziz çox olmuşdu elin gərəyi.

Əvəzsiz eyliklər qoymuşdu elə,
Bəlkə danışmağa o gəlməz dilə.

Sovet qurulanda Ermənistanda,
"Kulak"lıq gedəndə bütün hər yanda.

Sovet sədri oldu bibisi Zeynəb,
Ondakı cəsarət, ondakı ədəb.

Onu ilk komsomol qadın etmişdi,
Sədr kürsüsünə belə yetmişdi.

Bu gün də anılır şöhrəti, adı,
Dar gündə olmuşdu elin imdadı.

Neçəsini saxlamışdı sürgündən,
Neçəsini qurtarmışdı pis gündən.

Hacı Kərəm, oğlu Kalvay Əmrahı,
Bir də ki, qardaşı həm İsmeyili.
Nağı bəyin sürgünüydü sabahı,
Zeynəbin olmasa xeyirxah meyli.

Babakişilərdən Məsim, həm Cəmşid,
Daşkənddə başbilən adam nə ki, var.
Onları da gözləyirdi bu kilid,
Bu tələbdən Zeynəb çəkərək hazar.

Qanuna söykədi hər qərarını,
Bunlar tutularsa kim işləyəcək?...
Nə var əllərindən alaq varını,
Gedin azadsınız – bax belə deyək.

Zeynəbin qərarı bəyənilmişdi,
Ali komandanlıq alqışlamışdı.
Çoxları da bəd fikrə gəlmişdi,
Satıb bəy, xanları qisas almışdı.

Zeynəbin etdiyi bu xoş əməllər,
Göstərişi idi Əziz kişinin.
Ona görə onu sevirdi ellər,
Ucundan tuturdu hər bir işinin.

Çox kiçik olsa da Əziz Zeynəbdən,
Ondan üstün idi ağıl, kamalda.
Bəzən o hirslənib çıxanda təbdən,
Köməyə gəlirdi Əziz bu halda.

Hər işin yönünü o göstərirdi,
Deyirdi – üz vermə çox komsomola.
Çünki komsomollar belə deyirdi:
Gərək sürgün olsun hər axund, molla.

Atdan salmalıyıq biz seyidləri,
Onların atını biz minməliyik.
Onlar dedikləri hər öyüdləri,
Bax indi onlara biz deməliyik.

Ürəyi partlardı Hacı Balının,
Görsəydi, talançı bax bu dəmləri.
İşi müşgüldəydi Böyük Alının,
Artırdı qəm üstdən gündə qəmləri.

Həmən Qara Əziz, atası Xəlil,
Zeynəbin arxası, dərs verəniydi.
Zeynəb bəd fikirə düşəndə qəfil,
Ona sabahını göstərəniydi.

Aranı qataraq hətta bir dəfə,
Əzizi döymüşlər komsomolçular.
Böhtanları dəyməmişdi hədəfə,
İfşa olunmuşdu bu soyğunçular.

Atdan düşürmüşlər Seyid Bayramı,
Başçıl özümüzdən, özgə neçəsi.
Onda Əziz ilə bütün el hamı,
Almış aralıqdan bu bəd həvəsi.

Canını tapşırıb indi o Əziz,
Hamı əzizi tək onu ağlayır.
Həyatda qalıbdır saldığı hər iz,
Siminin naləsi ürək dağlayır.

Dərdi dağ saldı getdi,
Gözə ağ saldı getdi.
Qardaşım könüllərdə –
Şirin bağ saldı getdi.

Yandı qovruldu Şirin,
Kül tək sovruldu Şirin.
Gözündən leysan tökdü,
Saçını yoldu Şirin.

Sərrafam, ha sınadı,
Dost məni ha sınadı.
Canımda yüz dərdim var –
Bu dərman hansınadı?!

Torpağın qoynuna yollandı Əziz,
Dildə-dodaqlarda ballandı Əziz.

Xeyirxah əməllər onu yaşatdı,
Ad-sanı illərdən illərə çatdı.

Düşdü dastanlara Qara Əziztək,
Uçdu dodaqlardan bir şirin söz tək.

Bax budur dünyadan qalan var-dövlət,
Budur axirətə gedən o rəhmət.

Eşidək şairin bir hikmətini,
Onun hər kəs üçün nəsihətini.

***O dünyana tutar üçün,***
***Bu dünyadan halalıq al.***
***Hər gördüyün, görüşdüyün,***
***Qohum, yaddan halalıq al.***

***Məzarına nur apar get,***
***Yaxşı əməl sür apar get.***
***Eylikdən qürur apar get,***
***Hər bir zaddan halalıq al.***

***Fani ağa bükər səni,***
***Məzar səmtə çəkər səni.***
***İsidibsə əgər səni,***
***Ocaq, oddan halalıq al.***

## VII
## ƏLİ DAŞKƏNDDƏ BAĞ SALIR

Oxucum, əzəldən sənə demişdim,
Daşkənd daşlıq idi, mən bildirmişdim.

Bağ-bağça olsa da özgə kəndlərdə,
Bir ağac yox idi, bu tərəflərdə.

Dörd min hektar yeri olan bir kəndin,
Nə qədər gəzsən də bərəsin, bəndin.

Bir meyvə ağacı tapa bilməzdin,
Meşə ağacı da əsla görməzdin.

Üç-dörd yerdə söyüd ağacı vardı,
Onlara baxmaqda mətah olardı.

Bir neçəsi "Cabbarlı"da var idi,
Ona da çoxları ixtiyar idi.

Var idi bir neçə qızılgül kolu,
Tamam bağlı idi onun da yolu.

Hasara almışdı Səlimov Şahbaz,
Hamsı da deyirdi: Əl vurmaq olmaz!

Açanda qoxusu ətir saçırdı,
Ətrafda kim varsa ora qaçırdı.

Bu idi Daşkəndin bax yaşıllığı,
Bu oldu Əlinin bax fəallığı.

Əli ayrılmışdı ata yurdundan,
Köz də aparmışdı onun odundan.

Kənddə ən ucqarda ev də tikmişdi,
Bibisi Simini o gətirmişdi.

Ona da hazır ev almışdı Əli,
Yanında da qonşu olmuşdu Əli.

Əli zəhmətsevər bir kişi idi,
Zəhmətə bağlanmaq vərdişi idi.

Hər zəhmətdən xoş nəticə almışdı,
Arıçılığa da meylin salmışdı.

Vəzifə, rütbə öz yerindədi,
Təşkilat katibi rütbəsindədi.

Kolxozda nüfuzlu bir şəxsiyyətdi,
Bir müdir, təşkilat bir də heyətdi.

Təşkilat işinin o fəalıydı,
Rayon işçiləri bundan halıydı.

Rəğbət bəslənirdi ona həmişə,
Layiq bilinirdi ən məsul işə.

Oxucum mətləbdən uzaşdım bir az,
Aydınlıq gətirmək məncə pis olmaz.

Qayıdaq yenə də mətləb üstünə,
Əli girdi bağ salmağın qəsdinə.

Fikirləşdi – Basarkeçər, Qoşabulaq,
Ağacdan ağaca vururlar calaq.

Biz isə bir ağac əkə bilmirik,
Bu haqda heç niyə bəs düşünmürük.

Əlaqə saxladı ətraf kəndlərlə –
Bu ətrafda bitən hər meyvələrlə.

Oxudu lazımi kitabları da,
Dinlədi bağ salan bağbanları da.

Öyrəndi nə zaman əkmək lazımdı,
Budamanı necə etmək lazımdı.

Qışın şaxtasından necə qoruyaq,
Dayaq payaları haradan vuraq.

Bunların hamısını öyrəndi Əli,
Dərələyəz səmtə yollandı Əli.

Ordan hər cür meyvə tingi gətirdi,
Bir bağ saldı alma, armud bitirdi.

Qızardı bu bağda gilas, albalı,
Ağ, sarı əriklər, peyvənd şaftalı.

Yaxşı zoğal, əzgil ağacı əkdi,
Gündəlik onların nazını çəkdi.

Qızılgül koluna büründü dörd yan,
Apardı nə qədər ondan pay, uman.

Üç ilin başında bar verdi bu bağ,
İndi kömək çağır meyvəni yığaq.

Alma, armud bar verdilər tonlarla,
Məmnun qalmamışdı Əli bunlarla.

Peyvənd də olundu heyva armuda,
Gilas gilanara hamsı bu qayda.

Kənddə "Əli bağı" adlandı bu bağ,
Hər kimsə bu bağdan tutaraq soraq.

O da məhləsində bağ-bağça saldı,
O da zəhmətindən bax, razı qaldı.

Əli belə aldı bağban adını,
Kəsmədi elindən öz imdadını.

Oxucum, bax burda sındı ürəyim,
Qovruldu, ürəyim yandı ürəyim.

***Kimə qaldı o bağçalar, o bağlar,***
***Puça döndü o zəhmətlər, ay Allah.***
***Min zəhmətlə Əli salan o bağa,***
***Sahib çıxdı gavır itlər, ay Allah.***

***Uzandı üstünə qəzanın əli,***
***Qan törətdi keşişlərin əməli.***
***Qaçqın oldu, köçkün oldu göyçəli,***
***Talan oldu bütün kəndlər, ay Allah.***

***Keytiyə, Murova çıxa bilmirik,***
***Güc gəlib həsrəti yıxa bilmirik.***
***Ta indi Göyçəyə baxa bilmirik,***
***Bağlanıbdır bərə bəndlər, ay Allah.***

Oxucum, bağışla bir az tələsdim,
Neyləyim, sitəmdən titrədim, əsdim.

Sonra gələcəyik biz bu söhbətə,
Hələlik qayıdaq bir hekayətə.

# VIII
# ƏLİ ALİ TƏHSİL ALIR

Götür-qoy eylədi Əli hər şeyi,
Bəzən kimlərinsə xəlvət gileyi.

Çatırdı Əlinin qulaqlarına,
Neçə nadürüstlər dodaqlarına.

Alırdı həmişə ali təhsili,
Bax belə ötürdü onların dili.

Əlinin təhsili ortadır hələ,
Sonacan işləyə o bilməz belə.

Ya sovet sədiri, ya da təşkilat,
Silib atacaqdı onu bu həyat.

Bundan dərs götürdü Əli özünə,
Güc verdi gecələr indi gözünə.

Oxudu lazımlı dərslikləri o,
Topladı başına bilikləri o.

Girdi instituta Özbəkistanda,
Beş il təhsil aldı o bu məkanda.

Qiyabi qurtardı aqronomiyanı,
Özünə dost tutdu neçə insanı.

Yay vaxtı gələrdi Özbək dostları,
Bir ay saxlayardı Əli onları.

Gəzdirərdi dərələri, dağları,
Dörd yanı lilparlı gur bulaqları.

Beləydi bu kənddə elin adəti:
Qonağa etməli hamı hörməti.

Fərq etməzdi qonaq kimdi, kimnəndi,
El adəti ancaq bir hökümnəndi.

Hörmət bəsləməli hamı qonağa,
Süfrə açıb çağırmalı otağa.

Dostlar da gələrdi süfrə başına,
Dönüb olardılar can sirdaşına.

Şərab süzülərdi, tost deyilərdi,
Hətta ki, məclisə saz da gələrdi.

Şeir söylənərdi, saz dinlənərdi,
Bütün qonaqların üzü gülərdi.

Şeir söyləndikcə şair Əlişirdən,
Alqışlar qopardı lap yerbə-yerdən.

Bağrına basardı ozan da sazı,
Ruhu məst edərdi onun avazı.

***Əziz dostum, bizə gəlmək istəsən,***
***Bahar öz donuna bürünəndə gəl.***
***Dəstələ əlində şehli gülləri,***
***Bənövşə dağlardan görünənədə gəl.***

***Boş gəlmə gələndə gətir şirin dil,***
***Oxşasın qəlbini qoy süsən, sünbül.***
***Gözlə ki, oyansın bağçada bülbül,***
***Qızılgül səsinə səs verəndə gəl.***

***Çal meyə qarışsın durna avazı,***
***Odur müjdə verən çiçəkli yazı.***
***Dostların döşündə sədəfli sazı,***
***Axır taleyini düşünəndə gəl.***

Əli diplomunu aldığı bir gün,
Başlandı evində ayrı toy-düyün.

Təbriklər, alqışlar bəlkə min oldu,
Azrular, diləklər belə çin oldu.

Yoruldum – demədi Sumaya gəlin,
Qonaq söhbətindən ayrılaq gəlin.

Axı oxucuma mən söz vermişdim,
Sumayadan söz açacam demişdim.

İndi mən sözümə əməl edirəm,
Nə var olmuşları bir-bir deyirəm.

Əli getməmişdən hərbi orduya,
Gəlin gəlmiş idi evə Sumaya.

Xeyir duasıyla ağsaqqalların,
Kəbini kəsilmiş bu cavanların.

Axı Sübə, Sənəm getmişdi ərə,
Əl ata bilmirdi Maquş işlərə.

Hələ kiçik idi bu son beşik qız,
Hər işə Reyhan baxırdı yalnız.

Ev işi, çöl işi, mal-qoyun sağmaq,
Təndirə od vurmaq, xamır yoğurmaq.

Daha nələr-nələr... O görməliydi,
İçməyi, yeməyi bişirməliydi.

Kotana gedirdi Məsim, Köçəri,
Yola salmalıydı o körpələri.

Ancaq bir köməkçi gəlin olardı,
İşlərə dərindən nəzər salardı.

Qoçaq gəlin kimi evdə Sumaya,
Yetirdi hər zaman haya-haraya.

Qoymurdu təntiyə Reyhan arvadı,
Çalışırdı görə özü hər zadı.

Yaxın qohum idi Sumaya, Əli,
Onları calamış taleyin əli.

Sumaya Siminin nəvəsi idi,
Elbəyi bu qızın dədəsi idi.

Oxucum, gəlmişik mətləb üstünə,
Kağız aç, qələmi götür dəstinə.

Danışaq Əlinin kök nəsilindən,
Bilirəm, bunları umursan məndən.

# IX
# RZA QOCA, RZALLI

Ulu kök törənib Rza Qocadan,
Bu gün də səslənir adı ucadan.

Adı çəkiləndə rəhmət deyilir,
Hörmət kimi baş sinəyə əyilir.

Rza Alı o Qocadan törənib,
Sulduzdan Sədərək elinə gəlib.

Çox səfalət olub o vaxt İranda,
Xəstəlik yayılıb bütün hər yanda.

Ona görə qaçıb ordan çoxları,
Bura gətiribdir gərdiş bunları.

Burdan da Göyçəyə gəlib çıxıblar,
Əvvəl Toğlucada məskən salıblar.

Sonradan Daşkənddə məskunlaşıblar,
Kök atıb bu eldə aşıb-daşıblar.

Qalıb İmişlidə nəslin bir qolu,
Onlar da gedibdi biz gedən yolu.

“Hacı Söydümallar” adıyla onlar,
Qədim Mil düzündə yuva salıblar.

“Rzallı” adıynan bunlar anılıb,
Neçə tirə ilə eldə tanınıb.

Xəlil kişi Məşədi Orucun oğluydu,
Onun qol-budağı yaman çoxluydu.

“Hacı Məhəmmədlər”, “Dünyamalılar”,
Həm “Qocamanlılar”, “İsmayıllılar”.

Qoç Alıdan bəri “Sarı Əlilər”
Bir kökün qoluydu “Babakişilər”.

Hələ sanamıram qudalıqları,
Bax “Rzallı” birləşdirir bunları.

Əli ocağıdı indi bu mərkəz,
Təsif saxlamaqda yox ona əvəz.

Həmişə birliyə gələn tayfadı,
Əmin-amanlığı sevən tayfadı.

Sülhə çağırandı eli, obanı,
Alimi, həkimi hər bir çobanı.

İnsanlıq elmindən dərs alıbdılar,
Halal zəhmət ilə ucalıbdılar.

Əli nümunədi deyilənlərə,
Deyərdi hamıya bəlkə yüz kərə:

Əvvəl qiymət verin öz-özünüzə,
Özgələr pis gözlə baxmasın sizə.

Hər nə işiniz var özünüz görün,
Özgəyə söz deyib nə zəhmət verin.

Qalmasın boynunda özgə minnəti,
Tökməyin ortaya yersiz söhbəti.

Yoxdursa kimsənin təəssübkeşliyi,
Çoxdur qafasında onun səyliyi.

Özün saxlamasan öz təsivini,
Sabah bürüyəcək tənə evini.

Sən öz qardaşına durmasan arxa,
Özün yıxılacan bir dərin arxa.

Sən hörmət etməsən öz adamına,
Hörmət bəslənilməz sənin adına.

Qulluğunda dursun cavan qocanın,
Varsa bir xəstəsi kəsdirsin yanın.

Bu idi Əlinin verdiyi təlim,
Hamıya məsləhət gördüyü təlim.

Bu amal, əməlnən yaşamışdı o,
Dost, qohum yükünü daşımışdı o.

***Eldən aralansa təklənər, itər,***
***İgid arxalansa elə, güclənər.***
***Ümman parçalansa ada deyərlər,***
***Sızqa qarışarsa selə, güclənər.***

***Təkliyin hünəri xəyaldı, qardaş,***
***El-mahal birliyi vüsaldı qardaş.***
***"Tək əldən səs çıxmaz" misaldı, qardaş,***
***Əl kömək durarsa ələ, güclənər.***

***Əzizim, qalmayıb dünya heç kəsə,***
***Yaradıb, qurmağa insan tələsə.***
***Sözünü sözə qoş, səsini səsə,***
***Dil kömək durarsa dilə, güclənər.***

## X
## NİFTALIDAN ÇAĞIRIŞ GƏLİR

***Bir səyyaham, yuvasından, yurdundan,***
***Perik düşən ellərimi gəzirəm.***
***Könlümü oxşayan, qəlbimi alan,***
***Şirin-şəkər dillərimi gəzirəm.***

***Bir əl ordan, bir əl burdan gəl deyir,***
***Bir el ordan, bir el burdan gəl deyir.***
***Bir çöl ordan, bir çöl burdan gəl deyir,***
***Mən nərgizli çöllərimi gəzirəm.***

***Qayaları xınalanan, gül açan,***
***Gözəlləri xınasına əl açan.***
***Zirvələrdən dərələrə yol açan,***
***Daşqınımı, sellərimi gəzirəm.***

***Nə zamandı ah-aman, ün tapmışam,***
***Açılmayan bağlı düyün tapmışam.***
***Ağ-qaralı hər cürə gün tapmışam,***
***Mən Göyçəli günlərimi gəzirəm.***

Ay mənim həmdəmim, əziz oxucum,
Gəl səni oxşayım, gəl səni qucum.

Darda da, gendə də sən mənimləsən,
Ən ağır gündə də sən mənimləsən,

Enişdə, yoxuşda yormuşam səni,
Borana, yağışa salmışam səni.

Gəl ey, səyyah dostum, gəl ey, sirdaşım,
Məndən uzaq düşmə, ey yol yoldaşım.

Gəl, dönək, boylanaq keçmişə yenə,
O keçmiş doğmadı mənə, həm sənə.

Gəl, gəl yada salaq üçkünc məktubu,
Əziz dedi: – İntizarım budu, bu!

Məktub həsrət oldu Reyhana da,
Bu xoş xəbər yetişmədi ona da.

O da axirətə həsrətlə getdi,
Son anda könlündən Niftalı ötdü.

İndi Niftalıdan gəlibdi məktub,
Məktubun sədası yer-göyü tutub.

Bir yanda sevinc var, bir yanda yas var,
Bunun hər birinə böyük əsas var.

Bu bir sevincdir ki, Niftalı sağdı,
Bəs görək sonrası nə olacaqdı?

Əli partiyaçı, rəhbər işçidi,
Bu da öz işində bir döyüşçüdü.

Bu gün çağırış verib “plen” qardaşı,
Düşünmür ağrıyar Əlinin başı.

Baş-başa verəcək ağzı göyçəklər:
“Qardaşın plendi” – hey deyəcəklər.

Vətən satqınıdı, qaçıb döyüşdən,
Təhlükə qoxusu gəlir bu işdən.

Niftalı iş qurub səfirliklərlə,
Hər bir təşkilatla, həm birliklərlə.

Özü Moskvaya görüşə gəlib,
Yəqin bu görüşü o, asan bilib.

Bilmir ki, sovetin sərt qanunları,
Heç vaxt qəbul etmir bu oyunları.

Türkiyə görüşə izin versə də,
Sovet buna razı olmaz heç vədə.

Odur ki, görüşə Əli getmədi,
Heç bir təklifini qəbul etmədi.

Bəli, ay oxucum, indiki həsrət,
İndiki bu hicran, indiki firqət.

Hər iki tərəfə çox ağır oldu,
Əli ünvanına tənələr doldu.

Orda da Niftalı çəkdi əzablar,
Onsuz da keçmişdi əzablı yollar.

Münhendə, İsveçdə əsir qalmışdı,
İtalyadan onu türklər almışdı.

Çox bəlalar çəkmiş onun da başı,
Axırda olmuşdur türk vətəndaşı.

Orda menecertək işə başlamış,
Axı o təhsili burdakən almış.

İrəvanda üç il təhsildə olmuş,
Dayısı Xanlarla birgə oxumuş.

Orda kara gəlib həmən o təhsil,
Yüksəlib şöhrəti onun ilbəil.

İşləmiş sənaye nazirliyində,
Hər işi qurmuşdu öz gərəyində.

Ailə qurmuşdu türk qızı ilə,
Şadlanmış bir oğlu, cüt qızı ilə.

Qızlarının adı Reyhan və Ayhan,
Ana hörmətinə qoyulub Reyhan.

İrfan qoyulmuşdu oğlunun adı,
Onlardı qürbətdə ağzının dadı.

Bir kövrək hiss keçir hər an könlündən,
Bir xoş qoxu gələ kaş ki, vətəndən.

***Qürbətin baharı nəyimə gərək,***
***Vətənin qışına yetirin məni.***
***Ovutmaz könlümü yad elin gülü,***
***Vətənin daşına yetirin məni.***

***Cənnət olsa əgər qoynu dünyanın,***
***Əsiriyəm öz yurdumun, binamın.***
***Yolumu gözləyən qoca anamın,***
***Gözünün yaşına yetirin məni.***

Onu xəyal köhləni gətirdi doğma elə,
Topalandı başına ilkin dost, qohum hələ.

Qaçaraq atasının o boynuna sarıldı,
Gec gələn bacıların sanki bağrı yarıldı.

Sonra isə Niftalı ana qoynuna qaçdı,
Ananın saçlarında barmaqları dolaşdı.

Ana! Ana! can ana! – deyə səsi kövrəldi,
İndi isə görüşə bir-bir qardaşlar gəldi.

Bu Əli, bu Köçəri, bax bu da kiçik qardaş,
Gözləri uzaqlara dikildi yavaş-yavaş.

Bu gəzdiyi dağ-dərə, su içdiyi bulaqlar,
Şoşan, yemlik yığdığı biçənək aralıqlar.

Bax bu da “Su tökülən”, bu da “Borda təpəsi”,
Niyə nədən təntidi görən onun nəfəsi?

Kişnədi şahə qalxdı, onun xəyal köhləni,
Dedi ki, indi apar, Ankaraya sən məni.

Dayan, oxucum, dayan, bu görüş də olacaq,
Ancaq ki, bu görüşdə görən kimlər olacaq.

Bunu bir Allah bilir, biz isə gümandayıq,
Zamanın hakimləri, deyir ki, dumandayıq.

Bir Allah qova bilər, bu yoldan duman, çəni,
Onda görə bilərik, könüllər istəyəni.

Ümid də yaxşı şeydi, biz sığınaq ümidə,
Ümid bizi apardı, bu görüşə bəlkə də.

Hələlik məktublaşma davam etsin qoy belə,
Gəl mənim yol-yoldaşım, gəl biz verək əl-ələ.

Yola davam eyləyək Allah köməkdar olsun,
“Allah-Əkbər” kəlməsi dilimizdə car olsun.

# XI
# ƏLİ YÜKSƏLİŞ YOLLARINDA

Yumşaldı Sovetin sərt qanunları,
Aradan qaldırdı bəd oyunları.

Düşmən tərəfindən olan əsirlər,
Həbsə alınırdı bir neçə illər.

Arxaya dəyirdi onun xətası,
Əzablar çəkirdi ata, anası.

Bunlar Stalinin sərt qanunuydu,
Aydınlıq verməyən bir oyunuydu.

Elə ki, Xruşşov bax gəldi rəhbər,[1]
Tənqidə tutuldu bütün bu işlər.

"Şəxsiyyətə pərəstiş"tək sayıldı,
Mərkəzi komitə təzdən ayıldı.

Bəraət qazanıb əsir üzgünlər,
Azadlığa çıxdı bütün sürgünlər.

Senzuradan keçmiş bütün məktublar,
Hansı bir ünvana yollansa olar.

Türkiyə NATO-nun üzvi dövlətdi[2]
Gedişi Sovetlə zidd siyasətdi.

---

[1] 1953-cü ildə Nikita Xruşşov Sov.İKP MK-nın baş katibi seçilmişdir.
[2] 18 fevral 1952-ci ildən Türkiyə NATO-nun üzvüdür.

Ona görə görüş, bəxşiş olmazdı,
Hələlik bu məna bir duyulmazdı.

– Bəlkə elə döndü çarxın gərdişi,
Tərsinə döndərdi bütün hər işi.

Bu ümid, gümanla hələlik duraq,
Əli şərəfinə bir məclis quraq.

Kolxoz sədri gəlib o, Subatana,[1]
Məğrur baxışlarla baxır dörd yana.

Əli ünvanına böhtan atanlar,
Anonim yazanlar, ara qatanlar.

Ancaq deyimləri düşüb təsirdən,
Əlləri üzülüb bütün hər yerdən.

Daha Niftalıdan yaza bilmirlər,
O mətləb üstünə əsla gəlmirlər.

Yazırlar kolxozdan, ferma işindən,
Rəhbər işçilərin get-gəlişindən.

İşə cəlb edirlər qadınları da,
Bəd yola çəkirlər bax onları da.

---

[1] Subatan – Basarkeçər rayonunda kənd.

Subatanda "Seyid" eylədi bunu,
Böhtanı doldurdu özcə qoynunu.

Vəzifə güdənlər bunu edirdi,
Zəhmətkeş olanlar duyub, bilirdi.

Nə qədər inkişaf gedir kolxozda,
Hər tapşırıq başa yetir kolxozda.

Yerinə yetmirdi əvvəl planlar,
Həmişə kəsirdə qalırdı onlar.

Aradan qalxıbdı bu geriliklər,
Yerində görülüb hər tədarüklər.

Əmək haqqının da artıb dəyəri,
Əli bu kolxoza gələndən bəri.

Birə-beş yüksəlmiş hər bir güzəran,
Keçirir hər günü millət firavan.

Cavanlar təhsilin dalınca gedir,
Qocalar dövləti birə-beş edir.

Bax bu çalışqanlıq, zəhmətsevərlik,
Bax bu qayğıkeşlik, uzaqgörənlik.

Əlini gətirdi doğma kəndinə,
İndi sədr etdi öz Daşkəndinə.

Əvvəl təmizlətdi aralıqları,
Əkinə gətirdi boş torpaqlıqları.

Bulaq sularını yığdı bir yerə,
Ordan su payladı bütün evlərə.

Artdı fermalarda birə-beş sürət,
Ət, süd planları doldu nəhayət.

Bir deputat kimi Ali Sovetə,
Müslüm elçi oldu bu əyalətə.

Bax bu da Əlinin qələbəsiydi,
Qələbinin yüksək təntənəsiydi.

– Bax budur, meydana toplaşıb hamı,
Burda keçirilir "Məhsul bayramı".

Tədarük olunub taxıl, ot, saman,
Ət, süd tapşırığı bütün hər plan.

Kolxoza verilib keçici bayraq,
Gəlibdi hər yandan məclisə qonaq.

Dağlardan qayıdır zurnanın səsi,
Elin oynamağa gəlir həvəsi.

Alıbdı döşünə Hacı sazını,
Dinləyək sözünü, xoş avazını.

***Günəşdən yoğrulub torpağın daşı,***
***Bizim bu dağlara çən gələ bilməz.***
***Qəhrəman doğulub bizim bu ellər,***
***Heç kim bu meydana tən gələ bilməz.***

***Baxın igidlərin zəhmət tacına,***
***Hünərdə bənzərdi tərlan, laçına.***
***Yüz yaşlı babanın şəvə saçına,***
***Bu hava, bu suda dən gələ bilməz.***

***Hamı mənim kimi xoş xəyaldadı,***
***Ülvi əməldədi, pak amaldadı.***
***Əlləri zəhmətdə ağzı baldadı,***
***Daha bundan gözəl gün gələ bilməz.***

Hər yandan alqışlar gəlir aşığa,
Tanrı əhsən deyir bu yaraşığa.

Donqar bellər elə bil ki düzəlib,
Hamsı oynamağa meydana gəlib.

Babama bax "Məşdibadı" oynayır,
Nənəm ağız büzür, onu qınayır.

Bax bu da cavanlar, "Qaytağı" gedir,[1]
Kosa bu tərəfdə gör nələr edir.

Oxucum, qoy qalsın hər kəs işində,
Özgə bir söhbətə başlayım mən də.

---

[1] Azərbaycanın milli kişi rəqsi.

## XII
## NİFTALININ VƏFATI

***Nə qədər can deyib, əzizləsə də,***
***Nə mənli dünyadı, nə sənli dünya.***
***Nazlı gözəl kimi əl eyləsə də,***
***Nə mənli dünyadı, nə sənli dünya...***
***Son payı beş arşın kəfənli dünya.***

***Meylini meylinə salsan da belə,***
***Qoynunda min zəfər çalsan da belə.***
***Mən nökər, sən ağa olsan da belə,***
***Nə mənli dünyadı, nə sənli dünya...***
***Son payı beş arşın kəfənli dünya.***

***Gözəlliyə güvənməyin gözəllər,***
***Yuyucular sizi təzdən bəzərlər.***
***Torpaqda çürüyər o göz, o əllər,***
***Nə mənli dünyadı, nə sənli dünya...***
***Son payı beş arşın kəfənli dünya.***

***Elə yaranışdan həməndi, həmən,***
***Olmayıb sonacan tamından əmən.***
***Nə mən arxalanım, nə də sən güvən,***
***Nə mənli dünyadı, nə sənli dünya...***
***Son payı beş arşın kəfənli dünya.***

Bəli, yaranmışdan elə həməndi,
Pozulmaz qərarı, bərəsi-bəndi.

Bir kəslə etibar bağlayan deyil,
Əbədi bir ülfət saxlayan deyil.

Gec-tez yola salmalıdı gələni,
Almalıdı topladığı şələni.

Yığdığı var-dövlət, nə var sərvətdən,
Qızıldan daş-qaşdan, bəzək, ziynətdən.

Əcəl əllərini qoparacaqdı,
Qismət olsa kəfən, aparacaqdı.

***Mənəm-mənəm deyib baş aparanlar,***
***Axıradək baş apara bilməyib.***
***Xəzinə toplayıb, zər axtaranlar,***
***O dünyaya daş apara bilməyib.***

***Dünya oyuncaqdı naşı gözündə,***
***Olur ağılsızın başı gözündə.***
***Şahların quruyub yaşı gözündə,***
***Gözlərində yaş apara bilməyib.***

***Ay Şiruyə xanimanlar yıxanlar,***
***Ürəklər sındırıb, könül yaxanlar.***
***Torbasına altun, sərvət yığanlar,***
***Torbasını boş apara bilməyib.***

Bir dön geriyə bax hanı Süleyman?
Hanı Firon, Nəmrud, Salsal bey İman?

Cəmşidin taxtından hanı nişana?
Hanı Teymurləngə süd verən ana?

Torpaqdan yarandı, torpağa döndü,
Nə var yanan şamlar axırda söndü.

– Söndü Niftalının ömür şamı da,
Puç oldu arzusu, təb, ilhamı da.

Ümid gümanları düşdü kilidə,
Göz önünə Göyçə gəldi yenə də.

Ankara Göyçədi nəzərlərində,
Onun səmasının hər bir yerində.

Görürdü Göyçənin uca dağını,
Görürdü öz doğma od-ocağını.

Reyhan qızını ana bilirdi,
Ayhana hey Sübə, Sənəm deyirdi.

Ata, qardaş idi İrfan surəti,
Əcəl tamamladı bu hekayəti.

Tapşırdı canını altmış dörd yaşda,
Cavanlıq havası olsa da başda.

Əsirlikdə qazdan zəhərlənmişdi,
O vaxtdan ciyərlər zədələnmişdi.

İndi şiddətləndi həmən xəstəlik,
Ömrü dayandırdı o birdəfəlik.

## XIII
## İLHAMIN YENİ DAŞKƏNDƏ GƏLİŞİ

Çoxdan bir fikrə gəliblər evdə,
İlham təhsil alsın Yeni Daşkənddə.

Orada qurtarsın orta məktəbi,
Çox ciddidi o məktəbin tələbi.

Kim əməl edərsə həmən tələbə,
Asan qəbul olur ali məktəbə.

Orda çox tələbkar müəllimlər vardı,
O ciddi tələbi verən onlardı.

Tanrıverdı səs salıbdır Qafqaza,
Söz olammaz Tapdıq, Mehdi, Namaza.

Orda tələbkardır bütün müəllimlər,
Təhsilə bağlıdır hər bir əməllər.

Yarışlar, yazılar, olimpiada,
Yüksək keçirilir burda hər ayda.

Qəbula gedirsə savadlı uşaq,
Özcə savadıyla qəbul olacaq.

Bu fikirdə ikən Əli, Sumaya,
Bərdədən bir maşın gəldi buraya.

Yük gətirib "Sarı yer"də fermaya,
Ordan da yolunu salmış buraya

Sabah qayıdacaq Azərbaycana,
Dedilər İlhamı mindirək ona.

Əzizə tapşıraq nəzarət etsin,
Bibisi Səhnənin evinə getsin.

Orda qalsın, ordan getsin məktəbə,
Hazırlıqlı olsun hər bir tələbə.

Əli məktub yazdı Namaz müəllimə,
Yazdı: Salam olsun oba-elimə.

Ora göndərirəm oğlum İlhamı,
Nəzarət eyləsin müəllimlər hamı.

Orda təhsilini davam etdirsin,
Oradan da ali məktəbə getsin.

Tanrıverdi müəllim nəzarət etsin,
Onun sayəsində məqsədə yetsin.

Bir an buraxmasın nəzarətindən,
Uzaq eyləməsin mərhəmətindən.

Əli məktubu da verdi Əzizə,
Dedi – məktubumu çatdır üz-üzə.

Bütün müəllimlərə çatdır salamı,
Çox yüksək bilirəm mən bu inamı.

Əziz Əli ilə xoş ülfətdəydi,
Hər ikisi oxşar xasiyyətdəydi.

Baxmayaraq Əziz sürücü idi,
O da insanlıqdan bilici idi.

Əvvəldən səmimi dost idi onlar,
Bir-birin evinə gediş-gəliş var.

Evlərin xanımı – Sumaya, Gülşad,
Bu dostluq ülfətdən olmuşdular şad.

Bəli, ay oxucum, İlham ki, gəldi,
Qaldı Əlyargildə, orda dincəldi.

Sabah tezdən gəldi bibisigilə,
Ancaq ki bu evə çatmamış hələ.

Bir neçə qız gördü yol ayrıcında,
Hansısa bir maraq oyandı canda.

Üzünü çevirdi Əlyara sarı:
Dedi – mənə tanıt sən o qızları.

Qırmızı koftalı bax o qız kimdir?
Ətrafda nur saçan o ulduz kimdir?

Əliyar dedi dünən səni gətirən,
Bizim el-obaya ay dost, yetirən.

Əzizin qızıdır, adı Lenadır,
O da anasına oxşar sonadır.

İlham utansa da bu tez sorğudan,
Qeyri bir hiss tapdı ürək ağrıdan.

Bu ilk sevgi idi, məhəbbət idi,
İlk eşqin ətəşi müsibət idi.

Şair də bu haqda yaxşı deyibdi,
O da bu əzabda çox göynəyibdi.

***İlk eşqin həsrəti, ilk eşqin dağı,***
***Sevən ürəklərdə xal kimi qalır.***
***Dönür xatirəyə ilk görüş günü,***
***İlk öpüş dodaqda bal kimi qalır.***

***Bəlkə də bu eşqi duymur hər könül,***
***Tez incisə, tez barışar kür könül.***
***Eşqin gücünə bax,* dolu bir könül,**
***İstək qarşısında lal kimi qalır.***

***Ay keçir, il keçir ovunmur ürək,***
***Könüldə yaşayır sevdiyin mələk.***
***Əzizim, həqiqi məhəbbət, istək,***
**Dönür dastanlara, *ləl kimi qalır.***

## XIV
## İLHAMIN YENİ DAŞKƏND KƏND ORTA MƏKTƏBİNDƏ OXUMASI

İlham oxuyarkən Yeni Daşkənddə,
Söz-söhbət düşərdi bəzən məktəbdə.

Ortaya gələrdi istək-arzular,
Bir-birinə danışardı uşaqlar.

Təhsilini kim harada alacaq,
Kim həkim, mühəndis, müəllim olacaq.

İstəyə, sevgiyə çatar bu söhbət,
Başlanardı tamam özgə hekayət.

Bir-bir sananardı qızların adı,
Burda seçməzdilər qohumu, yadı.

Artıq məlum idi, Sərdar, Əmrəli,
"Namazdı"dan tutmuş onların əli.

Bir atmaca atdı İlham Əlyara:
– Deyən kürəkənsən sən sənətkara.[1]

Bir himə bənd imiş elə bil Əlyar,
Dedi: İlham çox çəkirsən qəm-qübar.

---

[1] Zurna ifaçısı Zamaxan Qəhrəmanov nəzərdə tutlur.

Hələlik sirrini aça bilmirsən,
Neyləsən istəkdən qaça bilmirsən.

Dayanıb hər zaman Lena qarşında,
Çarə tapammırsan dostum nə fayda?

Ancaq ki, məktəbdə görə bilirsən,
Olsa-olsa salam verə bilirsən.

Bilirsənmi əgər bilsə müəllimlər,
Sizin başınıza gələcək nələr...

İlham dərslərindən geriləmişdi,
Tanrıverdi müəllim ona demişdi:

Əgər çatdırmasan tapşırıqları,
Atana deyəcəm mən bu halları.

İlhamın dərdini bilirdi Telman[1]
Tövsiyə edirdi ona hər zaman:

– Çalış ki, məktəbi sən əla qurtar,
Qoy olsun əlində əsaslı tutar.

Sonra ürəyini açıb deyərsən,
Ya nişan, ya da ki toy eyləyərsən.

Hələ qızda durur, sən də durursan,
Bu tezliklə nə oyundu qurursan.

[1] Telman Musayev

İndi daha ciddi bax dərslərinə,
Bütün tapşırığı yetir yerinə.

Gileyli qalmasın səndən müəllimlər,
Əlaçı olmusan sən keçən illər.

Telman çox danışdı çox da deyindi,
Hazırla hər dərsi mənimlə indi.

Hər gün yatanadək birgə olarıq,
Bəzən gecələr də bizdə qalarıq.

Telmanın yerində tövsiyyələri,
Götürdü aradan gerilikləri.

– İlham əvvəlki tək dərsdə fəaldı,
Sevgi macərası bir özgə haldı.

Kitabın içində məktub ötürür,
Lena cavabını sabah gətirir.

– Pozulubdu halı bu gün İlhamın,
Görmür camalını axı Lenanın.

Lena bu gün dərsə gəlməyib nədən,
Bilmir ki, öyrənə xəbəri kimdən.

Tökülüb İlhamın qaşı-qabağı,
Fikirə gedibdi dərdli sayağı.

Uşaqlar kənarda baxıb gülüşdü,
Sərdarın yadına bir şeir düşdü.

Üzünü İlhama tutaraq Sərdar,
Dedi: – Ürəyindən keçirmi bunlar?

***Yaman darıxmışam səndən ötəri,***
***Əsmər yanağına qurban olum, gəl.***
***Dərdimə dərmandı bir kəlmə sözün,***
***Şəkər dodağına qurban olum, gəl.***

***Alıbsan əlimdən səbri-dözümü,***
***Üzdən təbəssümü, dildən sözümü.***
***Görmək istəyirəm səndə özümü,***
***Büllur buxağına qurban olum gəl.***

Bir şaqqaraq çəkdi uşaqlar yaman,
Bu dəfə ahəstə dilləndi Telman:

***Sevirəm deyən kimsəyə,***
***Sevmə demək cinayətdi.***
***Sevən kəsə biganəlik,***
***Xəyanətdi, xəyanətdi.***

***Yoxdursa bir mehribanın,***
***Əfsanədi ötən anın.***
***Bu dünyanın o dünyanı,***
***Yaraşığı məhəbbətdi.***

Şeirin sonluğu bitməmiş hələ,
Artıq başa çatdı böyük fasilə.

Daxil oldu sinfə Ramazan müəllim,
Ədəbiyyat dərsi: şeir, qəzəlim.

Bir də təkrarladı heca vəznini,
Dedi Füzulinin bir qəzəlini.

Əruz vəzni haqda başladı dərsə,
Uşaqları o gətirdi həvəsə.

Hecayla ölçülmür burda sətirlər,
Ayrı bir aləmdi bölgü-bəhirlər.

Böyük Seyid Əzim, böyük Füzuli,
Dahi Nizaminin, Vahidin dili.

Nə qədər mənalı qəzəl söyləmiş,
Onun hikmətini bəyan eyləmiş.

Hecayla əruzun fərqi deyildi,
Dərsin məzmununu uşaqlar bildi.

Bir-bir qəzəl dedi indi uşaqlar,
Geri qaydaydı kaşki o çağlar.

Müəllim Vilayətə söz verdi bu an,
Bu dinməz Vilayət dilləndi yaman.

***Gözlərim yollardadır, sevdiyim canan gələcək,***
***Məni odlara salan qaşları kaman gələcək.***

***Nə vaxtdan həsrətini çəkibəm müstər olmuşam,***
***Haqq göndərib dərmanımı, o təbib-loğman gələcək.***

Bu da Zülfüqarın ürəyindəki:
Elə dediyi tək olaydı təki!

***Salıbdı öz kəməndinə bir boyu bəsdə məni,***
***Aparır qəm evinə necə də ahəstə məni.***

***Sinəmdə eşqin odu, başımda sevda xəyalı,***
***Çəkir hicran bağına bir bülbül həvəsdə məni.***

Müəllim üzünü İlhama tutdu,
İlham hər bir şeyi sanki unutdu.

Elə bil güdürmüş o bu fürsəti,
Zərrəcə ehtiyat etmədi qəti.

Dilləndi bir natiq çıxışçı kimi,
Dindi ürəyinin inləyən simi.

***Yaşadar məhəbbəti düz əhdi-peyman – dedilər,***
***Yaşayan məhəbbətə yüz cürə qurban – dedilər.***

***Gözəlliyə səcdə qılıb, eşq üçün can verənə,***
***Aqillər qiymət verib, ən böyük insan – dedilər.***

***Eşq ilə dolu könül çıraqlı bir xanımandı,***
***Eşqsiz bir ürəyə susuz dəyirman – dedilər.***

***Eşqli bir ürəyin od, atəşı sönməz olar,***
***Bəxş edib o atəşi sevdiyi canan – dedilər.***

***Vətən eşqi də gərək hər eşqdən olsun uca,***
***Vətəni sevməyən kəs olacaq peşman – dedilər.***

Yer-yerdən uşaqlar alqış söylədi,
Əli dedi: Gör bu zalım neylədi?

– Bayaq tutulmuşdu qaşı-qabağı,
Əlyar dedi: – Gözləyirmiş bu çağı.

Gör necə göstərdi böyüklüyünü,
Açdı ürəyində olan düyünü.

Qızlar pıçıldaşıb baxdı İlhama,
Xəlvəti dedilər yetişsin kama.

Belə öyrəndilər əruz vəznini,
İndi də hər biri anır o günü.

Bu xəbər çatmışdı hər bir tərəfə,
Əli kişi yol tapmadı hədəfə.

Şişqayadan o gözaltı seçmişdi,
Ordan gəlin gətirəcəm demişdi.

Eşitdi İlhamın bu istəyini,
Alqışladı onun saf diləyini.

Oturdu üz-üzə oğulla ata,
Əli kişi dedi: – Bu toy-büsata,

Bu gündən hazıram ancaq, ay oğul,
Eşqinin gücünə olma belə qul.

Əvvəlcə çalışıb ali təhsil al,
Aldığın sənətdə olgunan fəal.

Sonra da eyləyək sənin toyunu,
Səni alqışlayaq, sevək boyunu.

– Oxucum, məqsədə kəsə gedirəm,
Nə var olmuşları bəyan edirəm.

Ali təhsil alıb İlham qayıtdı,
İndi subaylığın daşını atdı.

Ötdü "Qara zurna", dindi telli saz,
Hər birisi könül açan xoş avaz.

Zamaxan Bərdədə, Səyyaf Göyçədə,
Qara zurna ilə dindi bu vədə.

Yığdı el-obanı zurnanın səsi,
Ağsaqqal, ağbirçək bütün hər kəsi.

Oyuna çağırdı bu xoş havalar,
"Yallı" da getdilər qoca babalar.

"Vağzalı"ynan çıxardılar gəlini,
Verdi bəy əlinə gəlin əlini.

Yeridi bu anda şair qabağa,
O nələr söylədi görək bu çağa.

***Dünən yad olanlar bu gün doğmadı.***
***Sədaqətin gücünə bax, gücünə.***
***Ürəklərdə güllər açıb arzular***
***Məhəbbətin gücünə bax, gücünə.***

***Qulağından qız sırğalar asıbdı,***
***Bəy gülünü sinəsinə sıxıbdı.***
***Hər ikisi el önündə susubdu,***
***Ləyaqətin gücünə bax, gücünə.***

Bax bu alqışlarla, bu təmtəraqla,
Bu təmiz istəklə, bu xoş maraqla.

Lena gəlin gəldi bax bu ocağa,
İndi diqqət verək bir özgə çağa.

# XV
# YENİDƏNQURMA VƏ QAÇQINLIQ

Ölkədə "Yenidənqurma" gedirdi,
Əslində bir-birin vurma gedirdi.

Nə vaxtdan Qorbaçov hakimiyyəti,
Ortaya atmışdı bu siyasəti.

Siyasət dövlətə xəyanət idi,
Yenidənqurma da mahiyyət idi.

Qorbaçov, Reyqan danışıqları,
Təsdiqə salmışdı bu oyunları.

Dənizin altında gedən bu söhbət,
Təsdiqə minmişdi axır nəhayət.

İcraçı Qorbaçov, hakim Reyqan,
Çökdürdü Soveti o zaman-zaman.

Alman divarları söküldü əvvəl,
Başlanğıc anıydı hələ bu əməl.

Sovet təsirində olan dövlətlər,
Hansı ki qalmışdı illərlə mələr.

Hansı bu təsirdən çıxdı kənara,
Qorbaçov əl atdı indi gör hara?

Daxildə yaratdı böyük çaxnaşma,
Təzədən düşünmə, təzdən oyanma.

Latviya, Litviya, həm Estoniya,
Alqışlar söyləndi bu oyanmaya.

Sovet təsirindən onlar da çıxdı,
Qorbaçov dövləti bax belə yıxdı.

Onsuz da sarsılmış Sovet dövləti,
Qəbul etdi özgə bir siyasəti.

Millətlərarası düşdü davalar,
Talandı yurd yeri, köçdü obalar.

Faciə baş verdi Özbəkistanda,
Faciə baş verdi həm Gürcüstanda.

Azərbaycan ağır siyasətdəydi,
Ona atılan tor tamam fitnəydi.

Çoxdan hazırlanmış bir plan idi,
Qorbaçov bu xalqa bir ilan idi.

Çalmaq istəyirdi hər bir yanından,
Qorxmurdu tökülən insan qanından.

Əvvəl ordu qırdı Azərbaycanı,
Sonra qızışdırdı Ermənistanı.

Qorbaçov savaşı saldı ortaya,
Dünya lənət deyir indi bu vaya.

Xocalı yox oldu bircə gecədə,
Sakit durdu rəhbərlər necə də.

Bu oldu dünyanın faciə kəşfi,
Müsəlmanı qırmaq idi hədəfi.

Qovuldu müsəlman Ermənistandan,
Dədə, baba yurdu o xoş məkandan.

Göyçənin üçüncü qaçqınlığıydı,
Ermənilər çəkən sinə dağıydı.

Belə təsvir edir şair o halı,
Belə ağlar qalmış Göyçə mahalı.

***Ulu Göyçə, ulu vətən, ulu yer,***
***Var-dövlətlə, naz-nemətlə dolu yer,***
***Ustadların ay beşiyi, yolu yer,***
***Qurban olum torpağına, daşına.***
***Bu nə qaldı gəldi yenə başına?***

***Ay beşiyim, imək yerim, bəy evim,***
***Pir bildiyim torpaq evim, göy evim.***
***Sizdən ayrı ay ocağım, ay evim,***
***Mən olmuşam qaçqın, köçkün, didərgin,***
***Heç olarmı bundan artıq betər gün?!***

***Balayanlar, bolyaniklər dirildi,***
***Dövrün hökmü keşişlərə verildi.***
***Baş bilənlər yenə sürgün sürüldü,***
***Nəcəfə də, yaman hiylə qurdular,***
***Onun kimi bizə də od vurdular.***

Göyçə qaçqın düşür üçüncü dəfə,
Elə qoyulub ki, bu son hədəfə.

Gedən köçlər bir də geri qayıtmaz,
Bu fitnədən dünya bizi ayırmaz.

Bir həftə içində Göyçə boşaldı,
Doğma yurd-yuvalar yağıya qaldı.

Payızın son ayı hava qar-çovğun,
Fikirlər qarışıq, karvanlar yorğun.

Haraya baxırsan qaçqın köçləri,
Əlinin nə yaman dolub gözləri.

Baxır gözaltı, baxır hər yana,
Sumaya təsəlli versə də ona.

Qalxmaq istəməyir daşın üstündən,
Yanıqlı bir nalə qopur dilindən:

***Qoy sürtüm gözümə torpaq-daşını,***
***Düşdük qucağından biz cida, Göyçə!***
***Ölsəm ruhum gəzər zirvələrini,***
***Sənə deyəmmərəm əlvida, Göyçə!***

***Gedirik, qoynunda çathaçat qalır,***
***Yığdığımız nə var qatbaqat qalır.***
***Atam, anam səndə amanat qalır,***
***Saxla, torpağına mən fəda, Göyçə!***

***Yol tutun, ay oğul, mən də gəlirəm,***
***Bu son ayrılıqdı, çoxdan bilirəm.***
***Hicranına çətin dözəm, ölürəm,***
***Barı eylə mənə son nida, Göyçə!***

Yanaşı tikmişdi üç qardaş evi,
Hər birinin tikdirdiyi daş evi.

Ağlağan gözlərə getmə deyirdi,
Mənim nəzərimdən itmə deyirdi.

Üç qardaş – Köçəri, Məsim və Əli,
Doğma yurddan qaçqın düşdülər, bəli.

Köçəri köçünü çəkdi Gəncəyə,
Oğlu İkram kömək eyləsin deyə.

Bakıya üz tutdu Əli, həm Məsim,
Bir azdan Bakıdan gələcək səsim...

# XVI
# ƏLİ KİŞİ BAKIDA YAŞAYIR

Əli yurd salmışdı indi Bakıda,
Qaçaqaçda evi dəyişib o, da.

Erməniyi göndərmişdi Göyçəyə,
Özü də Bakıda yerləşsin deyə.

Mahir də onunla birgə qalırdı,
Hər qərarı atasından alırdı.

O da evlənmişdi, ailəliydi,
Şöhrəti saf amal, xoş əməliydi.

O da müəllim idi, ali təhsilli,
Həm xoş xasiyyətli, həm şirin dilli.

O yaxşı bilirdi ixtisasını,
Elmə bağlayırdı hər əsasını.

Nurəli qalmışdı Özbəkistanda,
Təhsili almışdı həmən məkanda.

Özbək qızı ilə evlənmişdi o,
Onun ülfətinə isinmişdi o.

Ayrı ev almışdı Bakıda İlham,
Atasına baş çəkirdi o, müdam.

Hörməti, izzəti iş yeri vardı,
Qohum-qardaş qeydinə də qalardı.

Belə rahatlıq tapmışdı Əli,
Möhkəm yapışmışdı Tanrıdan əli.

Özü məşğul idi arıçılıqla,
Yaz, yay fəsilləri o alaçıqla.

Arını aparıb dağa çıxardı,
Arı bal, özü də çiçək yığardı.

Yadına salardı ulu Göyçəni,
Zümzümə edərdi könlü deyəni.

***Kaşki, olmayaydı əbədi yadlıq,***
***Ümidə, gümana dönəydi Göyçə.***
***Üz tuta biləydik bəzən üstünə,***
***Təbrizə, Tehrana dönəydi Göyçə.***

***Barı qonaq kimi gəzib gələydik,***
***Qönçə güllərindən üzüb gələydik,***
***Doğma ocaqları süzüb, gələydik,***
***Dosta, mehribana dönəydi Göyçə***

***İlahi, kaş belə fərman olaydı,***
***Göyçə bizə İran-Turan olaydı.***
***Bir anlıq vüsalı dərman olaydı,***
***Təbibə, loğmana dönəydi Göyçə.***

Payız, qışda arı kənddə qalardı,
Arıya qudası Əziz baxardı.

Qonaq tək gələrdi Əli, Sumaya,
Qayıdışı çəkərdi bəzən bir aya.

Burda yaşayırdı Rzallı[1] tamam,
Söhbətlər edərdi Əli də müdam.

Hacı Dünyamalı, Hacı Məhəmməd,
Belə başlanardı əvvəlcə söhbət.

Sonra söz keçərdi Qocamanlıya,
Ordan Namazlıya, İsmayıllıya.

Sarəllər, Babalar[2] yaddan çıxmazdı,
Heç kəsi, heç kəsi o unutmazdı.

Hətta qızlara da baş çəkərdi o,
Evi olmayana ev tikərdi o.

Bunların hamısı Rzallı idi,
Bu tayfa çox köklü, çox qollu idi.

Gəncədə İkrama xəbər çatanda,
Yetirərdi o özünü bir anda.

[1] Rzallı – Rza Alılı tayfa birliyinin qısadılmış adı
[2] Babakişilər nəzərdə tutulur.

Aparardı əmisini Gəncəyə,
Bir neçə gün orda dincəlsin deyə.

Gələrdi Köçəri, həm daşkəndlilər,
Göyçədən söhbətlər başlardı nələr...

Aşıq məclisinə keçərdi söhbət,
Sazı götürərdi Hacı[1] nəhayət.

Bəzən də olardı Aşıq Nuriddin,
Aşığa qulaq as, nə danış, nə din.

"Kərəmi" üstündə saz dillənərdi,
Aşıq nalə çəkib, hey göynəyərdi.

***İstərəm bir dəfə görüb üzünü,***
***A Göyçəm, dolanıb başına dönüm.***
***Qoynunda qazdırıb məzar yerimi,***
***Sənin torpağına, daşına dönüm.***

***Şirin öpüş alım bulaqlarından,***
***Sərin meh istəyim yaylaqlarından.***
***Tökülüm sinənə yanaqlarından,***
***Ağlar gözlərinin yaşına dönüm.***

***Şiruyə, yaram var göynəmək üçün,***
***Əlacım qalmayıb neynəmək üçün,***
***Hüsnünə tamaşa eyləmək üçün,***
***Uca qayaların qaşına dönüm.***

[1] Aşıq Hacı Bayramov nəzərdə tutulur.

İkram Səbuhiyə verərdi sazı,
Olmasa da Səbuhinin avazı.

Bütün havaları yaxşı çalardı,
Dinləyənin qəlbinə od salardı.

İkram Səbuhinin atası idi,
Onun şöhrətinin sədası idi.

Gəncədə bir böyük vəzifədəydi,
Yol patrol alaya o bir dədəydi.

Heyif, bir qəzaya tuş gəldi İkram,
Rəhmət söylənilir ruhuna müdam.

Bu haqda açacam sonra mən söhbət,
Məqsədi mənzilə çəkim nəhayət.

Belə çıxarırdı Əli hər qışı,
Yoxlayaraq, oyadardı yatmışı.

Kimin nə dərdi var, məlhəm edərdi,
Kimin nə işi var ora gedərdi.

Hörmətli dostları var idi onun,
Dosta etibarı var idi onun.

Yunis Rzayevtək sirdaşı vardı,
İslam kimi dostu, “qardaşı” vardı.

Ona deyirdilər “Səxalı Əli”
Hər dosta, qohuma vəfalı Əli.

Təsivin verməzdi o bir simsarın,
Səhvini deyərdi hər günahkarın.

## XVII
## "DAŞ QÜRBƏTƏ DÜŞƏR YÜK ƏYİLƏNDƏ" VƏ YA "BİRCƏ DAŞ, BİR OVUC TORPAQ VƏTƏNDİ"
***(İlhamın Göyçədən gətirdiyi daş)***

***Göyçə dedim, – gözlərimdən,***
***Yenə qan gəldi, qan gəldi.***
***Bu ayrılıq həsrət, hicran***
***Mənə dan gəldi, dan gəldi.***

***Səbr kasam aşdı, daşdı,***
***Xəyal yüz yerə dolaşdı.***
***Vüsal bizdən uzaq qaçdı,***
***Yaman an gəldi, an gəldi.***

***Gördü dünyanın oynunu,***
***Qaçqınlar bükdü boynunu.***
***Ana torpaq, aç qoynunu,***
***Sənə can gəldi, can gəldi.***

Oxucum, bilirəm sən də mənimtək,
Dərin fikirlərə olmusan yedək.

Yazılan başlığı oxuyan zaman,
Gəlir xatirinə İbrahim, Aslan.

Ata qəzəbinə gələn oğlanlar,
Doğma yurdlarından qovuldu onlar.

Qəzəbli Zülal şah hököm vermişdi,
Ancaq son güzəşti belə demişdi.

Xəzinəyə ancaq cəllad ötürsün,
Hər biri qiymətli bir daş götürsün.

Şəhərdən kənara atılsın onlar,
Belə başa yetsin bu bəd oyunlar.

İki qardaş qovulmuşdu bax belə,
Oxucum, məqsədə tələsmə hələ.

Dastandan bir deyim gətirək yada,
İbrahim Aslandan düşəndə cida.

Gözlərindən qanlı yaşlar ələyir,
Ərz edib halını belə söyləyir.

– "Zülal şah oğluyduq biz iki qardaş,
Hərəmiz götürdük bir qiymətli daş.

Aslan İbrahimsiz tökər qanlı yaş,
Məzarsanlıq İbrahimi neylədin?"

Yerində deyibdi aqil bir dədə,
"Daş qürbətə düşər yük əyiləndə".

İndi yük əyilib daş qürbətdədi,
Məqsədimiz bax bu hekayətdədi.

Qəza gəldi, yurd yuvalar dağıldı,
Faciəli bu bir böyük nağıldı.

Əli kişi ayrılanda evindən,
Ah-nalələr qopdu onun dilindən.

Məhlə torpağından boxça bağladı,
Böyük töhfə kimi onu saxladı.

İlhamı bürüdü onda göz yaşı,
İki kubik boyda yekə bir daşı.

Götürüb yüklənən maşına qoydu,
Bu nisgil, bu həsrət qəlbini oydu.

Bakının Xırdalan yolunda o daş,
Böyük nişangaha dönübdü qardaş.

Yazılıb üstünə "Göyçənin daşı",
Həmən sözlər ilə bir də yanaşı.

İlham Xəlilovun yazılıb adı,
O daş çoxlarının olub imdadı.

Göyçə yanğısını söndürən daşdı,
Sınıq könülləri dindirən daşdı.

Bu daş təmsil edir burda Göyçəni,
O daş haraylayır məni həm səni.

– Doğma yurd-yuvanı unutma deyir,
O sönən sobanı unutma deyir.

Daşdan heykəl yonsun bir heykəltaraş,
Bənzəsin Ələsgər, Alıya o daş.

Bir üzü Ələsgər, bir üzü Alı,
Qoy burda anılsın Göyçə mahalı.

Şair də nə gözəl təsvir eyləyib,
O, ustad-şəyirddən belə söyləyib.

***Oxudum kəlməni inci, zər gördüm,***
***Mənada həm kəsər, həm hünər gördüm.***
***Hayandan boylandım Ələsgər gördüm,***
***Alı zirvəsinin qucağında mən.***

Eh kimdi, tər töküb heykəli yonan,
Keçmiş ərənləri, ərləri anan.

Nəcəfin belində qaynar samovar,[1]
Diri-diri basdırılan uşaqlar.

Heykələ dönsəydi dünya baxardı,
Onda duru sular bizə axardı.

[1] Ermənilər 1919-cu ildə Daşkəndli Aşıq Nəcəfin belinə odlu samovar bağlayaraq işgəncə ilə öldürüblər.

Göyçəyə dağ çəkən o Selikovun,
Yardımçısı olan o qovhaqovun.

Başını gətirən Hacı Rəhimin,[1]
Neçəsini deyim kimin və kimin...

Heykəli nə vaxtdan yonulmalıydı,
Hünər sahibi tək anılmalıydı.

Ancaq ki, bizdəki bu biganəlik,
Silinib, atılmır vallah hələlik.

Həsrəti, hicranı olsa da ağır,
Burda İlham üçün alqışlar yağır.

Bu adicə daş da bir təsəllidi,
Vətənə məhəbbət ondan bəllidi.

Bir deyim yenə də gəlir yaddaşa,
Məhəbbət bəslənir adi bir daşa.

***Bir addım geriyə çəkilmərəm mən,***
***Bircə daş, bir ovuc torpaq vətəndi!***
***O torpaq üstündə bitən hər kökün,***
***Göyərtdiyi yarpaq, budaq vətəndi!***

Bax adicə bu daş sayılır Vətən,
Biganə hallardan söz açacam mən.

[1] Hacı Rəhim Molla Şəfi oğlu (1860-1921)

Bir addımda qaçdıq üç günlük yolu,
Şamaxı bir qolu, Bakı bir qolu.

Qaçqın, köçkün köçü yayıldı getdı,
Yazıq, fağır kimi sayıldı getdi.

Arxalı kişilər arxasız qaldı,
Erməni Göyçəni davasız aldı.

Gözəl deməyibmi şair bu haqda?
Səslənsin bu deyim yaxın-uzaqda.

Biz ölmədik, biz qovulduq,
Qovulmaq ölümdən betər.
Biz ölmədik, biz soyulduq,
Soyulmaq ölümdən betər.
Biz ölmədik öləydik kaş,
Vətənin nə olduğunu.
Köçkünün nə olduğunu,
Qaçqının nə olduğunu.
Elə o vaxt biləydik kaş,
Axı bizə tanış idi.
Bu qaçqınlıq, bu köçkünlük,
Vətən eşqi, yurd həsrəti.
Bir də, bir də didərginlik,
Bu dərsləri neçə dəfə.
Yedirtmişdi yağı bizə,
Gülab deyə, şərbət deyə.
İçirtmişdi ağı bizə,
Göyçə kimi böyük mahal.

İki dəfə qovulmuşdu,
Qaçqın olub, köçkün olub.
Ürəyindən ovulmuşdu.
Yadımızdan niyə çıxmış.
Bəs görəsən həmən çağlar,
Qulağmızdan niyə düşmüş.
Bəs görəsən o sırğalar?!
Yağıyamı inandıq biz?!
Göz açandan bizə qarşı
Silah tutub kin bəsləyən.
Dığayamı inandıq biz?!
– Nə inanmaq sirdaş olduq,
Quda olduq, qardaş olduq.
Əzizləyə, əzizləyə
Tərif yazdıq, mahnı qoşduq.

***Alnı açıq, qəlbi açıq Yerevan,***
***Əzəl gündən biz qardaşıq Yerevan.***

Bu məkrli qardaşlarla,
Uzaq yola yoldaş olduq.
Tədbiri onlar tökdülər –
Biz dinmədik, biz daş olduq.
Hər səfərdə, hər mənzildə,
Yuxu tutduq, yuxuladıq.
Hər nə versə "dostlarımız"
Mətah kimi qoxuladıq.
Anlamadıq dostlarımız –
Qəsdən bizi yuxuladıb.

Varımızı Yeravana,
Hara, hara ulamladıb.
– İndi guya ayılmışıq,
Guya qoçaq sayılmışıq.
Yaxa çöldən açılıbsa,
Daraq teldən açılıbsa.
Kəmər beldən açılıbsa,
Ayılmaq ölümdən betər.

Ölümdən betərdi belə ayılmaq,
Ölümdən betərdi fağır sayılmaq.

Qurbanı olmuşuq bu fağırlığın,
İndi altındayıq bu ağırlığın.

Güc çatmır, qaldırıb, ata bilmirik,
Ümidə, gümana çata bilmirik.

Onun-bunun ətəyindən tutmuşuq,
Xaçpərəstin yedəyindən tutmuşuq.

O ətək, o yedək bizə biganə,
Eyləyib bu dərdlər bizi divanə.

Ötüb gedib, yarım əsrin yarısı,
Başlanmayıb hələ dərsin yarısı.

Bu ATƏT, bu NATO heç nə verməyir,
Yazıq millət hələ sonluq görməyir.

## XVIII
## ƏLİNİN TÜRKİYƏYƏ GEDİŞİ

Sovet dövləti ki, tamamən çökdü,
Sərhəd dirəyini hər tərəf sökdü.

Qovuşdu bir-birinə uzanan əllər,
Qovuşdu bir-birinə bu həsrət ellər.

Araz gəl-gəl dedi o tay, bu taya,
Əllər, qollar körpü oldu bu çaya.

Vüsal göz yaşları çaya töküldü,
Tikanlı sərhədlər tamam söküldü.

İllərlə gülməyən Arazın üzü,
Ötürdü zülməti, tapdı gündüzü.

Ucaltdı səsini qardaş Türkiyə,
Qanbir qardaşına can deyə-deyə.

Anıldı Atatürk böyük atamız,
Açdı qollarını Heydər babamız.

Hər iki tərəfə tutdu üzünü,
Belə aşkarladı o, haqq sözünü.

“Bir millət, iki dövlət”,
Bu böyük bir məhəbbət.

Bu böyük bir doğmalıq,
Bu böyük bir həqiqət.
Bu böyük bir sədaqət,
Bu ən böyük bir hikmət.
Türkiyə, Azərbaycan –
Biri ürək, biri can.
Türkiyə, Azərbaycan –
Biri nəfəs, biri can.
Türkiyə, Azərbaycan –
Bir camaldı, iki göz.
Türkiyə, Azərbaycan –
İki ürəkdə bir söz.

Oxucum, keçmişi bir sal yadına,
Demişdim haqq çatar el imdadına.

Tanrı qapı açar, bir loğman gələr,
Ümid ilə dolu, xoş zaman gələr.

Əliylə Niftalı görüşməsə də,
Onlar qucaqlaşıb, öpüşməsə də.

Övladlar bir-birini görə biləcək,
Gələcək, belə bir zaman gələcək.

Yetirdi İlahi həmən zamanı,
Verdi hər tərəfə bir xoş gümanı.

Əmisinə dəvət göndərdi İrfan,
Atanın ruhu da şad oldu bu an.

Hazırlaşdı yola Əli, Sumaya,
Dost-qohum sevindi bu haqqı-saya.

Hərə qəlbindəki diləyi dedi,
Apar bizdən də bu ürəyi – dedi.

Göyçə torpağını götürdü Əli,
Tanrı dərgahına açıldı əli.

Şükürlər eylədi Ulu Tanrıya,
Təyyarə Bakıdan qalxdı səmaya.

Ax necə uzandı bu iki saat,
Ola bilməyirdi Əli heç rahat.

Vüsal göz yaşları onu boğurdu,
Sanki, gözlərindən leysan yağırdı.

Bir-birini tanımayan doğmalar,
Necə görüşəcək görəyin onlar.

Cüt bacı, bir qardaş əldə dəstə gül,
Təyyarə səmada görüncək qəfil.

Reyhan, Ayhanın titrək səsləri,
Ətrafda dayanan hər bir kəsləri.

Həm də ki, İrfanı kövrəltdi yaman,
İrfan dizi üstə çökdü bu zaman.

O da İlahiyə şükürlər etdi,
Ata vəsiyyəti dedi ki, yetdi:

Mənə tapşırardı əmini axtar,
Ey Tanrı, xoş ana sən verdin qərar!

Bu an təyyarədən gəliş başlandı,
Əli pilləkəndə bir az dayandı.

Boylandı hər yana, gözləri doldu,
İlahi bu görüş nə yaman oldu.

Sarıldı bir-birinə əmi balalar,
Kaş belə olaydı həsrətli anlar.

Ayrılmaq bilmirdi biri-birindən,
Tamam dəhşət idi yerbəyerindən.

Ay şair qələmi götür əlinə,
Könlündən nə gəlir gətir dilinə.

***Həsrətləri tapışdırıb İlahi,***
***Görüşə bax, görüşə bax, sən Allah.***
***Bir-birinə sarmaşıq tək sarılıb,***
***Öpüşə bax, öpüşə bax, sən Allah.***

***Dillər laldı, baxışların içində,***
***Arzular var alqışların içində.***

***Bu sevincdən göz yaşların içində,***
***Gülüşə bax, gülüşə bax, sən Allah.***

***Ötən illər qar yağdırıb saçına,***
***Son qoyubdu cavanlığın tacına.***
***Vüsal elçi təpər verib qıçına,***
***Yerişə bax, yerişə bax, sən Allah.***

Yol aldı şəhərə maşın limandan,
Əli xahiş etdi, indi İrfandan.

Əvvəl Niftalıyla görüşək, gedək,
Sarmaşaq, doyunca öpüşək gedək.

Lənət ötən günə, ötən zamana,
Bizi yetirmədi ümid, gümana.

Ankarada böyük bir məzarıstan,
Daşlar xəbər verir qohumdan, dostdan.

Bu da Niftalının nakam məzarı,
Gülə büləyibdi öz övladları.

İlahi, – nə dəhşət, daş qardaş olub,
İndi Əli ilə başabaş olub.

Əli sarmaşıq tək sarılıb daşa,
Adi daş dönübdü qanbir qardaşa.

Daş tamaşa edir, Əli ağlayır,
Dilsiz başdaşını hey qucaqlayır.

Göyçə torpağını səpir məzara,
Böyük təsəllidi bu uşaqlara.

İndi doğma evə yetişir onlar,
Dönür xatirəyə bütün olanlar.

On gün qonaq qaldı Əli, Sumaya,
Nə qədər yerlilər gəlir bu haya.

Nə qədər süfrələr açılır bu an,
Özünü yetirir yenə vaxt, zaman.

Yenə də ayrılıq, yenə də həsrət,
Əli qəbristana gəlir nəhayət.

Gəlib Niftalıyla vidalaşır o,
Bu cansız daş ilə hey baxışır o.

Bu anda qəlbindən keçən fikirlər,
Bizə də, sizə də gör deyir nələr.

***Qardaş, bu dünyada aralı düşdük,***
***Görüşə biləydik o dünyada kaş!***
***Qanbir qardaş kimi, dərdimənd kimi,***
***Öpüşə biləydik o dünyada kaş!***

***Xoş əməl çıxarar məhşər odundan,***
***Dinib, danışaydı Tanrı adından.***
***Ay qardaş dadaydıq cənnət dadından,***
***Gülüşə biləydik o dünyada kaş!***

Öpür baş daşını gəlir limana,
Deyir Reyhana, Ayhan, İrfana.

Bakıda qohumlar gözləyir sizi,
Gəlib, sevindirin siz qəlbimizi.

Beləcə get-gəliş davam elədi,
Doğmaları xoş sevincə bələdi.

## XIX
## DİN İÇİNDƏ DİN BƏSLƏNDİ

***Yenə zülüm, sitəm gəldi,***
***Dəyişdi hallar, ay Allah!***
***Tutuldu bərələr, bəndlər,***
***Bağlandı yollar, ay Allah!***

***Xaçpərəst vurdu düyünü,***
***Qəm çulğadı ömrü-günü.***
***Yasaq oldu İslam dini,***
***Çatıldı qollar, ay Allah!***

***Nə varsa məscid, məqbərə,***
***Sökülüb, töküldü yerə.***
***Ziyarətgah sərhədlərə,***
***Çatmadı əllər, ay Allah!***

***Çıxdı Allahsız bileti,***
***Yox etdi hər bir adəti.***
***Din əhli dinmədi qəti,***
***Lal oldu dillər, ay Allah!***

Oxucum, – bir anlıq dönək keçmişə,
Keçmiş bizə dərs veribdi həmişə.

Yada salaq sovet sədri Zeynəbi,
Yada salaq o zamankı tələbi.

Şimala, cənuba bölünən ölkə,
Əsarət halında sürünən ölkə.

Qırmızı İmperiya zəncirindəydi,
Hökümlər, qərarlar çox dərindəydi.

“Kulak”lıq, sürgünlük baş alıb, gedir,
Səbəblər, günahlar bilmirsən nədir?

Harda səbəb soran bir nəfər varsa,
Döyülür, söyülür salınır qarsa.[1]

Hakimlik eyləyir komsomolçular,
Talayır hər yanı bu soyğunçular.

Əlindən alınıb hər kəsin varı,
Yoxdur özündə də öz ixtiyarı.

Yaşaya da bilməz öz adətincə,
Quldarlıq, qulluqdu bu hallar məncə...

Yasaq olunubdu adət, ənənə,
Cəzalar verilir Allah deyənə.

– Allahsız bileti paylanır xalqa,
Haqsız qılınc tutur İlahi, haqqa.

[1] O vaxtkı türmə nəzərdə tutulur.

Yaratdığın bəndə gör nələr edir,
Sənin qüdrətinə tənələr edir...

Sən şahidsən ya Rəhman, ya Rəhim,
Qadağan olunub "Qurani-Kərim".

Gizlənib qalıbdı axund, mollalar,
Gedir ortalıqda bir özgə hallar.

Quran da oxunmur ölüb, gedənə,
Musiqi səslənir hey dönə-dönə.

Xaçpərəst adəti düşübdü dəbə,
Müsəlmanlıq qoyulubdu hədəfə.

Deyənməzsən Allah, imam, peyğəmbər,
Desən gör başına gələcək nələr...

Hətta yaz gəlişi "Novruz" bayramı,
Ehtiyatla dolanardı el hamı.

Yasaq etmişdilər bu bayramı da,
Bir ehtiyat gərək idi hamıda.

Gizlin eyləməli nə var adəti,
Ancaq adətlərə el məhəbbəti –

Qoymurdu adətlər silinə, itə,
Millət yad vərdişə, adətə yetə.

Əzəldən demişdim Göyçə mahalı.
Cavanı, qocası, əhli-əyalı.

Hamı sadiq qaldı öz keçmişinə,
Əsla uymadılar yad vərdişinə.

Daşkənd bu mahalda dindar kənd idi,
Hətta açılmayan bənd, bərə idi.

İranlı Ağ Axund bu kənddə idi,
Alim səviyyəli bir həddə idi.

Burda Axund Şəfi, – Qareyi-Quran,[1]
Burda Hacı Rəhim, Mehdi həm Şaban.

Molla Avdıhüseyn, Abuzər, Həsən,
Neçəsini yaddan saldım deyəsən.

Bunlar müəllim idi İslam dininə,
Hər an durardılar qiblə yönünə.

Oruc tutub, qılardılar namazı,
Əzimlinin Bayramının avazı.

Hüseyn matəmində hey səslənərdi,
Bu matəmə el yığılıb gələrdi.

[1] Qareyi-Quran – Quranı tərcümə edən.

Sonradan Daşkənddə Molla Əmirxan,
Onun ilə birgə neçə nohəxan.

Şəhidlər şahına yas saxlayardı,[1]
Qırx gün nohə deyib, hey ağlayardı.

Yazılıbdı bir mötəbər hədisdə,
Söylənsə vacibdir hədis bu yerdə.

Şəhid olmasaydı İmam Hüseyn,
Yox olub gedərdi yəqin ki, bu din.

Hüseynə borcludur cümlə müsəlman,
Hüseyn deyib: – Mənə gətirən iman –

Qoy məni yad etsin, məni ağlasın,
Bütün əhli-beytə ümid bağlasın.

Məni ağlasalar şad olar babam,
Həsəni Müştəba, həm anam, atam.

Hüseyn üçün gözdən axan bir damla,
Məhşər günü yetişəcək vüsala.

Şərifi hədisi deyib Əmirxan,
Bir nohə başladı Hacıyla, Fərman.

[1] Şəhidlər şahı – İmam Hüseyn

***Ey qundağı qanla dolan,***
***Əsğərim laylay, Əsğərim laylay.***
***Ey ciyəri şan-şan olan,***
***Əkbərim laylay, Əkbərim laylay.***

***Qönçə-qönçə gülü solan,***
***Xeyməsinə kafər dolan.***
***Toy hənası qandan olan,***
***Qasimim laylay, şakərim laylay.***

***Yol axtarıb yolsuz qalan,***
***Qılınc çalıb halsız qalan,***
***Ey cəsədi qolsuz qalan,***
***Abbasım laylay, sərdarım laylay.***

***İbni Ziyad girib qəsdə,***
***Qoşun gəlir dəstə-dəstə.***
***Yataqda bimari-xəstə,***
***Səccadım laylay, müstərim laylay.***

***Yıxdılar sərdar oğlunu,***
***Hüseyni sərvər oğlunu,***
***Mahı-münəvvər oğlunu,***
***Ey babam laylay, Heydərim laylay.***

***Quruyubdu, dönmür dilim,***
***Başlar oldu dilim-dilim,***
***Hansının göz yaşın silim,***
***Fatiməm laylay, madərim laylay.***

***Könlünü bağlar Şiruyə,***
***Sinəsin dağlar Şiruyə,***
***Dil deyib ağlar Şiruyə,***
***Ey ağam laylay, sərvərim laylay.***

Ələm gəzdirərdi o, Qərib Abbas,
Pəhləvan cürətli, səsi xoş avaz.

Qəsidə deyərdi, ələm coşardı,[1]
Bəzən Abbas qayalıqlar aşardı.

Qoyulan nəziri tapardı ələm,
Bu sirri qüdrətə baxardı aləm.

Nohə deyilərdi qırx gün, qırx evdə,
Olsalar da bir qorxulu hədəfdə.

Dörd yanı xaçpərəst olan ölkədə,
Faciə yoluydu bunlar bəlkə də.

Verilərdi İmam Hüseyn ehsanı,
Haqqa çağırardı hər müsəlmanı.

Haqdan nicat diləyərdi hər insan,
Demişdim oxucum, sənə bir zaman.

[1] Sehirli beşbarmaq yoğun əl ağacına bağlanar, onu da Qərib Abbas götürərdi.

Bu müşkül düyünü bir Allah açar,
Bağlı yolumuza o işıq saçar.

Ancaq sarsılmazdır onun qüdrəti,
Gəldi üstümüzə bax mərhəməti.

Güclü dövlət öz-özünə dağıldı,
Dediyimdən bu çox böyük nağıldı.

Tarixə yazılıb bu böyük nağıl,
Sovet dövlətini yıxdı kəm ağıl.[1]

Yox, mən səhv eylədim, İlahi yıxdı,
Millətin heyfini onlardan çıxdı.

Məndə şükür edib ulu Tanrıya,
Bir dastan yazıram bu haqqı-saya.

***Yetmiş il qış gördük, bahar görmədik,***
***Şükür İlahiyə, qışı çıxardıq.***
***Ağır daş atmışdı zaman quyuya,***
***Hökm təzələndi, daşı çıxardıq.***

***Açdıq başımıza keçən cilovu,***
***Yaxamızı buraxmayan tilovu.***
***Nankora vermişdik aşı, plovu,***
***Nankorun ağzından aşı çıxardıq.***

[1] Mixail Qorbaçov nəzərdə tutulur.

***Çəpər çəkilmişdi tamam dörd yana,***
***Yad olmuşduq haqq deyilən imana.***
***Yaş odun qoymurdu ocaqlar yana,***
***Qurunun içindən yaşı çıxardıq.***

***Özündə deyildi bir kəsin huşu,***
***Hamı hey güdürdü qəpik-quruşu,***
***Qəfəsdə qalmışdı azadlıq quşu,***
***Axır ki, qəfəsdən quşu çıxardıq.***

Çıxdı əsarətdən indi hər ölkə,
Nuri pak salavat biz çəkə-çəkə.

Haqqın qüdrətinə şükür eyləyək,
Yenə İlahidən nicat diləyək.

Olan müşkülləri o, açsın yenə,
İşıq saçsın “Allah-Əkbər” deyənə.

– Bəli ziyarətgah yollar açıldı,
Yenə mömünlüyə işıq saçıldı.

Açıldı Həcc yolu, Kərbala yolu,
Olduq iman dolu, məhəbbət dolu.

Üz tutmaq istəyən ziyarətgaha,
Bir qorxu, bir təşviş duymadı daha.

Çoxdan arzusuydu Əli kişinin,
Bəlkə əfsəliydi hər bir işinin.

Gedib Kərbəlanı ziyarət etsin,
Bu müqəddəs arzu, diləyə yetsin.

Öpsün Hüseynin məzar daşını,
Axıtsın gözündən qanlı yaşını.

Bax budur bu arzu yerinə yetir,
Əli ziyarətə üz tutub gedir.

## XX
## ƏLİ KİŞİ ZİYARƏTƏ GEDİR

Əli ziyarətə gedənə qədər,
Deyim, ziyarətdə olubdu kimlər:

Əli kök-soyundan Məşədi Məmməd,
Hacı Dünyamalı, Hacı Məhəmməd.

Kərbalayı Camal, Məşədi Oruc,
Hər vaxt namaz qılıb, tutarmış oruc.

Yetmiş nəfər vardı ziyarətçilər,
Rəğbət bəsləyibdi bütün kəndçilər.

Onlara hər hörmət bəsləyibdilər,
Onları mömüntək səsləyibdilər.

İndi ziyarətə gedir nəvələr,
Bir vaxt yəhərlənib atlar, dəvələr.

Bu yolu bir aya gedərdi onlar,
Öndə sərkərdətək zəvvar olanlar.

İndisə bir günə tamamlanır yol,
Minik maşınında çox rahat ol.

Əli kişi hazırladı sənədi,
Xəbər çatdı, gediləcək vədədi.

Yollandı İraqa ziyarətçilər,
Onlarla birlikdə həm bələdçilər.

Məşhəd şəhərində rahatlandılar,
Ziyarət hal üçün təlim aldılar.

Sabahı başlandı ziyarət anı,
Ziyarət eyləyib İmam Rzanı.

Xanım Məsuməni yad eylədilər,
Məscid Cəmkaranı yad eylədilər.

Cəmi müşdeyidi Qum şəhərində,
Ziyarət etdilər gedən hər bəndə.

İndi Kərbəlaya rəvan oldular,
Burda rahatlanıb, bir gün qaldılar.

Yenə təlimçilər təlim verdilər,
Sabah üçün bir hazırlıq gördülər.

Ziyarət başlandı sabah tezdəndən,
İlahi xoş qismət dilərəm səndən.

Bax bu Hüseynin ziyarətgahı,
Bax bu da İmamın o qətligahı.

Hüseyn məzarına sürünür Əli,
Gözünün yaşına bürünür Əli.

Yalayır torpağı, öpür məzarı,
O imam aşiqi, söz xiridarı.

Qol açıb, məzarın üstünə sinir,
Ağlar gözləriylə bax belə dinir.

***Öz-özümü duyan gündən ağlar nohəxanıyam,***
***Ərşə qalxan naləm ilə ağlaram Hüseynimə.***
***Gün nədir, ay nədir ki – fanidən axirətə,***
***Dəmadəm matəm-əza saxlaram Hüseynimə.***

***Könlümdə əzizlərəm Əkbərimin nəşini,***
***Boğazından oxlanan Əsğərimin nəşini,***
***Həzrəti Abbas kimi şakərimin nəşini,***
***Balamı qurban kimi bağlaram Hüseynimə.***

***Göydə mələklər ağlar, kafər bu vaya gəlməz,***
***Kufə əhlilər kimi düz haqqı-saya gəlməz,***
***Haqq yanında bilirəm günahım saya gəlməz,***
***Axirət ümidimi bağlaram Hüseynimə.***

***Bir Allah yaxşı bilir, günahımı, cəvrimi,***
***Taki görüm ağamı[1] bol eyləsin səbrimi,***
***Gen qazın, dolduracam göz yaşımla qəbrimi,[2]***
***Mehdi zühurunatək ağlaram Hüseynimə.[3]***

---

[1] Axirətdə ağam İmam Hüseyni görüm.
[2] Qəbirdə də Hüseyni ağlayacam, qəbir göz yaşıyla dola bilər.
[3] İmam Zamanın zühur vaxtına qədər.

Kimlərdi İmamın sağ-sol kənarı,
Qoy indi söyləyim bax mən bunları,

Əliyyi-Əkbərin ziyarətgahı,
Əliyyi-Əsğərin ziyarətgahı.

Ətrafında yetmiş iki şühada,
Din yolunda canı edənlər fəda.

Həzrəti Abbasın ziyarətgahı,
Şükür sənə yerin, göyün pənahı.

Dilində car edib Əli bunları,
Haqq üçün qəlbində xoş olanları.

Dedi: – Şükür bu vüsala yetişdim,
Həzrəti Abbasla mən də görüşdüm.

Göz yaşıyla dedi: – Hanı qolları,
Axı eşitmişdi o bu halları.

Qollar düşdüyü yer ziyarətgahdı,
Ziyarət eyləmək böyük mətahdı.

Əlinin yadına düşdü bir nohə,
Ağladı nohəni o deyə-deyə.

***Niyə qolların kəsilib,***
***Belə cüt bədəndən, Abbas!?***
***Axıdırsan qanlı yaşı,***
***Ala gözlərindən, Abbas!***

***Niyə dodağın quruyub,***
***Susuzluqdan belə, qardaş?***
***Bizi kimə tapşırırsan,***
***Bircə gəl dilə, qardaş.***
***Di gətir öpüm üzündən,***
***Qara gözlərindən, Abbas!***

***Yol gözlər əhli beyit,***
***Baxıb əlləri duada.***
***Niyə bizləri qoyursan,***
***Belə dözülməz cəfada?***
***Fərat çayı qan axır,***
***Sənin əllərindən, Abbas!***

Əli diz qatladı o yerlərdə də,
Gözdən qan ağladı o yerlərdə də,

Həbib İbni Məzahirin məzarı,
İbrahim Kazımın qəbir divarı.

Əlinin dil dodağıynan yalanır,
Gözlərinin yaşı ilə sulanır.

Şəhadət məqamı Əli-Əkbərin,
Şəhadət məqamı Əli-Əsğərin.

Abbasın qolunun düşdüyü yerlər,
Zeynəb yatan, Hürrü yatan qəbirlər.

Bir səcdəgah olur Əliyə burda,
Axtarır Füzuli hardadır, harda?

Bu da Füzulinin ziyarətgahı,
Ürək ağasıydı, şəhidlər şahı.[1]

Əhdi başa çatdı dəfn oldu burda,
Hüseynə qul kimi o qaldı burda.

İmamı Zamanın məqamını da,
İmamı Sadiqin məqamını da.

Əli kişi öpüb ziyarət edir,
Ziyarət əhlilər Nəcəfə gedir.[2]

Beş gözəldən biri Həzrət Əlinin,
Peyğəmbər vəsisi – Şiri-Vəlinin.

Həsən, Hüseyn, Həzrət Abbas atası,
Həzrət Fatimanın haqdan butası.

Burdadır müqəddəs ziyarətgahı,
O sirri Xafiyyə, güc-qüdrət şahı.

---

[1] İmam Hüseyn nəzərdə tutulur.
[2] Nəcəf-əl-Əşrəf şəhəri nəzərdə tutulur.

Saleh peyğəmbərin qəbri burdadı,
Neçəsinin məqam yeri burdadı.

Qan yaş ilə doldu Əlinin gözü,
Gəldi dodağına qəlbinin sözü:

***İki dünya xoşbəxtiyəm, çün aşiqəm Əliyə,***
***Baş endirib, səcdə qıllam mən dəmadəm Əliyə.***
***Qismət ola məhşər günü başmağını cütlüyəm,***[1]
***Qulamının qulamı tək olam həmdəm Əliyə.***

***Odur millət şəfadarı, iki cahan sahibi,***
***Düldül atlı, Zülfiqarlı, mərdi-meydan sahibi.***
***Dini İslamın carçısı, o xoş Quran sahibi,***
***Lənət gəlsin kafərlərə, etdi sitəm Əliyə.***

***Yerə, göyə lərzə düşdü o, Əntəri böləndə,***[2]
***Sındırdı neçə tilsimi şəhri Zərə gedəndə.***
***Canım olsun ona fəda, şəhadətə yetəndə,***
***Haqq evində məleykələr tutdu matəm Əliyə.***

Əhdə xilaf çıxan Kufə şəhəri,
Burda dolanırlar çox xiymələri.

Ziyarət edirlər çox məqamları,
Bax bu ünvanları, bax bu adları.

---

[1] Ayaq geyimlərini mən təmizləyib, verəm.
[2] Əntər dünyada ən güclü pəhləvan olub.

İmam Zeynalabidin, İdris peyğəmbər,
Yüz iyirmi dörd min cəmi elçilər.

İmam Sadiq, İmam Zaman məqamı,
Burdadır ziyarət eyləyir hamı.

Xızır peyğəmbərin məqamı burda,
Əlinin möüzə, kəlamı burda.

Bax burda Əliyə qılınc çalınıb,
Bu məsciddə son namazı qılınıb.

Nuhun, İbrahimin həm də Adəmin,
İlk atası olan külli aləmin,

Məqamı burdadır – ziyarətgahdı,
Bu gün də onlara Tanrı pənahdı.

Müslüm İbni Əqil, Muxtar həm Hani,
Burdadır, yaxın gəl məzarın tanı.

Burdadır məqamı Haqqı Rəsulun,
Əli kişi geniş açaraq qolun.

Düşdü üzü üstə öpdü o yeri,
Süzüldü göz yaşı yanaqdan bəri.

Əli kişi belə qəm-qəhər yedi,
Yenə də qəlbindən keçəni dedi.

***Ya Qəhhar, ya Qüddus, Bismillahir Rəhmanir-Rəhim,***
***Allah Əkbər, la şəriki – haqdı dini Məhəmməd.***
***Beş pənci ali-əba, hər iki dünya sərvəri,***
***Millətinə şəfadardı məhşər günü Məhəmməd.***

***İbrahim Xəlilullah ilkin yapdı Kəbəni,***
***Peyğəmbərə şəkk edənlər sökdü, çapdı Kəbəni.***
***Mədinədən qayıdanda gəldi, tapdı Kəbəni,***
***Bəzədi öz əlləriylə haqq öyünü Məhəmməd.***

***Gündə beş vaxt səcdəyə get, Şiruyə, eylə vəfa,***
***Məhşər günü sayə salar, eylər dərdinə dəva,***
***Yetəndə mehrac evinə Məhəmməd-əl Mustafa***
***Yeddinci qat göydə qoydu məleykəni Məhəmməd.***

Məqamına yetdi İmam Baqirin,
İmamı Səccadın seyidlər pirin.

Meysət Tammarı da ziyarət etdi,
İndi Samiraya bu karvan getdi.

Burda dəfn olunub Həsən-Əsgəri,
İmamı Hadinin burdadır qəbri.

İmamı Zamanın anası Nərgiz,
Burda dəfn olunub, burda salıb iz.

Bibisi Həkimə burda dəfn olub,
İmamı Zamana burda hökm olub.

Qaib olub həmən bu sərdabədən,
Ziyarətgah olub həmən vədədən.

Təqinin, Kazımın ziyarətgahı,
Olsun yaxşıların hər an pənahı.

Əli kişi yetdi bu qismətə də,
Belə xoş qismətə yetsin hər vədə.

Museyibə şəhərinə gələndə,
Qoşa qardaş məzarını görəndə.

Ağladı Müslümün balalarına,
İbrahim, Məhəmməd oğlanlarına.

Bir nohə yadına düşdü bu zaman,
Onları tutanda Haris bey imam.

Qardaşlar ağlayıb belə deyirmiş,
Sarılıb bir-birə hey göynəyirmiş.

***İki qardaşıq atasız,***
***Varımızdı bir anamız.***
***Anamız da göz dikibdi***
***Biz iki cavana Haris.***

Yenə də güc verdi Əli gözünə,
Qəbir torpağından sürtdü üzünə.

Yenə hər birini ziyarət etdi,
Əli istəyinə, kamına yetdi.

Rəşt, Tehran, Rey, Astarada da,
Qədəmşah sayılan Nişanparda da.

Ziyarət olundu İmamzadələr,
Belə başa çatdı bu xoş vədələr.

Əlinin qəlbindən keçən bu oldu,
Hər kəlmə nur olub, qəlbinə doldu.

***Dəli könül, aç gözünü, bu qoca dünyanı gör,***
***Qətrələrə meyil salma, sən bacar ümmanı gör.***
***Adil kimdi, qadir kimdi – yeri-göyü yaradan,***
***Məhəmmədə nazil olan müqəddəs Quranı gör.***

***Qolu bağlı bir nökərsən Şahimərdan Əliyə,***
***Düldül atlı, zülfüqarlı, sirri pünhan Əliyə.***
***Məzlumların köməkdarı, canım qurban Əliyə.***
***Döndəribdi haqq yoluna necə müsəlmanı gör.***

***Həsən, Hüseyn qulusan, çağır yetsin dadına,***
***Fəda eylə can-başını həzrət Abbas adına.***
***Şümrü ləin, ibni Ziyad yandı məhşər oduna,***
***Bir bax necə qəbul olub, İsmayıl qurbanı gör.***

***Yüz iyirmi dörd min nəbi gəlib, gedib haxdı bu,***
***Beş pənci ali əba heç millətdə yoxdu bu.***
***Ömrə, günə bel bağlama, bir ötəri taxtdı bu,***
***İnanmırsan dön geriyə, taxtı Süleymanı gör.***

***Mehdiyisahibəlzaman çəkilibdi pünhana,***
***Müşgülünə çarə gəzən könül bağla sən ona.***
***Həyat özü bir məktəbdi cəmi qanan insana,***
***Bu beş günlük dar fənada gəl yaxşı, yamanı gör.***

## XXI
## GÖZDƏN UZAQ DÜŞƏNLƏR
***(Əli Xəlilovun vəfatı)***

***Aman Allah, o ürəyə dərd vermə,***
***Əzəlindən o ürəyin dərdi var.***
***Mərd ürəyə mərd dərd verki, çəkilsin,***
***Dərdlərin də namərdi var, mərdi var.***

***Elə dərd ver, barı sonra sovuşsun,***
***Ümid-güman bir-birinə qovuşsun.***
***Heç olmasa təsəlliyə uyuşsun,***
***O ürəyin dərd, qəm dolu yurdu var.***

***Bu fanidi qananlara yad gələn,***
***Min adı aparıb, minbir ad gələn.***
***Hamı peşman baxan, zəri bəd gələn,***
***Ortalıqda bir sehrli nərdi var.***

Əzəlindən dedim Əli xeyirxah,
Qohum-əqrabaya darda bir pənah.

Səksəni haqlayan, bir kişi idi,
Hamını yoxlamaq vərdişi idi.

Hara getsə dost tapardı özünə,
Yanardı dərdlinin alov-közünə,

Atalıq etmişdi qardaşlarına,
Qardaşlar ata tək baxırdı ona.

Çox idi qəlbində niskil-həsrətlər,
Ürəkdən xəlvəti çəkirdi nələr...

Xeyli vaxt idi ki, xoş anlardaydı,
Daha yaxşı ümid-gümanlardaydı.

Atalar düz deyib, sən sayını say,
Gör sənə fələkdən gələcək nə pay...

Qardaşı Məsimin şah oğlu getdi,
Əlinin qəlbini tarimar etdi.

İlqar oxuyurdu akademyada,[1]
Gənc ikən ömrünü o, verdi bada.

Məsimin özüsə düşdü qəzaya,
Qarışdı onun da vayı bu vaya.

Bacısının əri Yusif də getdi,
Axirət evinə İkram da yetdi.

Yuxarda mən bundan açmışdım söhbət,
Növbə Sumayaya yetdi nəhayət.

Sumaya Əliyə bir sirdaş idi,
Sumaya Əliyə dost, qardaş idi.

---

[1] Polis Akademiyası

Sumaya Əliylə nəfəs alırdı,
Əlinin qeydinə hər an qalırdı.

Bir insan ürəyi, bir belə dərdlər,
Bağlanan bərələr, bağlanan bəndlər,

Əlinin qəlbini tarimar etdi,
Sumayadan sonra Əli də getdi.

Sumayadan sonra bir il yaşadı,
Sumayayla getdi ömrünün dadı.

Maşına oturub kəndə gəlməyə,
Yenə dost-qohumu yoxlasın deyə.

Ürəyi dayanıb oturan anda,
Gedib axirətə xoş bir imanda.

O, iman əhliydi, namaz əhliydi,
Haqqı deyən ürəyiydi, diliydi.

Əlidən sonra da ortancıl qardaş,
İkramın atası, Əliyə sirdaş.

Dözmədi dərdlərə daha Köçəri,
Qardaş, qardaş – deyib susdu dilləri.

***Çəksən can yanğısı, göz ağrısıdı,***
***Sağalmaz yaradı qardaş ölümü.***
***Dünyanı dolanıb gəzsən nə qədər,***
***Tapılmaz çaradı qardaş ölümü.***

***Ürəyindən şirə çəkib yetişən,***
***Nə sağalan, nə kəsilən, bitişən,***
***Könlünü göynədib, qəlbinə düşən,***
***Silinməz qaradı qardaş ölümü.***

***Harayına ha səsləsən hay gəlməz,***
***Mətahından bircə tikə pay gəlməz.***
***Yüz dost olsa qardaşına tay gəlməz,***
***Ürəknən paradı qardaş ölümü.***

Çox böyük sarsıntı yaratdı məndə,
Mən təzəcə iki başlıq gedəndə.

Nurəli sağıydı, Özbəkistanda,
Onun da ürəyi həmən məkanda.

Dayandı, dəfn oldu o da Bakıda,
Atasının, anasının yanında.

# XXII
# HƏYAT DAVAM EDİR

Yenə üz-üzədi oğulnan ata,
Oğulu gətirən bax bu həyata.

Ata cansız daşdı, danışmır, dinmir,
Bu gəliş, gedişi bəlkə də bilmir.

İlhamın qəlbindən keçənlər nədi...?
Deyək o sözləri indi vədədi.

***Səsləyirəm, səs vermirsən,***
***Dar günümə dayaq ata.***
***Sən olmusan əzəlindən,***
***Həyatıma mayaq ata.***

***Hər çətini yara-yara,***
***Hər sitəmi qıra-qıra.***
***Üz tutduğum hər cığıra,***
***Oldun nurlu çıraq ata.***

Ata danışsaydı deyərdi: – Oğul,
Hər insan ömrü sirli bir nağıl.

Bəlkə bir dastandı, bir hekayətdi,
Bu nə ahuzardı, nə müsibətdi.

Dünya hikmətinə yaxşı nəzər sal,
Səni aparmasın qeyri bir xəyal.

Gəlib, gedəcəkdi yaranmış insan,
Bunu yaxşı anla, bunu yaxşı qan.

Hanı, məndən qabaq, gələnlər hanı?
Görə bilirsənmi Şah Süleymanı?

Tanrının sevdiyi beş gözəl hanı?
Adəm, – ilkin gələn o əzəl hanı?

Neçəsini sayım, ay oğul sənə?
Nədir müraciətlər edirsən mənə.

Atalıq borcumu mən yetirmişəm,
İndi vaxtım çatıb, bura gəlmişəm.

Sən də öz borcunu yetir yerinə,
Qardaşın, bacının sən hər birinə.

Atalıq, qardaşlıq qayğısı göstər,
Yetiş harayına tutarın qədər.

Sən ata əvəzi, böyük qardaşsan,
Hər birinə pənahdarsan, sirdaşsan.

Dost ol Mahir ilə, qardaş olsan da,
Bir ol hər bir anda ayrı qalsan da.

Yoxla Nurəlinin uşaqlarını,
Nəslinin, kökünün uzaqlarını.

Yad bilib, heç zaman uzaşma ondan,
Bağlan el-obaya ürəkdən, candan.

El sənin arxandı, el köməyindi,
Eldən gələn hörmət öz əməyindi.

Eldən aralansan yazıq olarsan,
Oğul, təklənərsən darda qalarsan.

Elindən elm öyrən, elindən dərs al,
Elin ürəyində özünə yurd sal.

***Eldən dərs alasan, gərək el üçün,***
***Yaşayıb, öləsən el deyə-deyə.***
***Gülə sərf eyləyər bülbül ömrünü,***
***Köçər bu dünyadan gül deyə-deyə.***

***Cəsarət odur ki, zirvələr aşa,***
***Sel kimi kükrəyə, daşqın tək daşa.***
***Elin hörmətiylə çəkilə başa,***
***Xainə, xəbisə öl deyə-deyə.***

***Tarix yaddaşında saxlaya onu,***
***Hər könül könlünə bağlaya onu,***
***Əzizi ölmüş tək ağlaya onu,***
***Hər oba, hər mahal dil deyə-deyə.***

Oğul evdə hörmətini itirmə,
Özgədən başına töhmət gətirmə.

Tamaha, nəfisə çox da aldanma,
Nahaqq tərəfində heç vaxt dayanma.

Çox kəsərli olur haqqın qərarı,
Əzəl, axır sən görəcən bunları.

Sındırma özünü dar ayaqda da,
Şax dur, nikbin dayan hər bir çağda da.

Hökümlü olanda hökmə güvənmə,
Aqillər yanında əvvəldən dinmə.

Hər kini, küdrəti at ürəyindən,
Onlar qoy verməsin çat ürəyindən.

Düz ol, düz həmişə əyrini kəsir,
Həyat hikmətləri bax belə deyir:

***Bacar düşmənini dostuna çevir,***
***Düşmənə çevirmə oğul, dostunu.***
***Bütün dostlarından gərəkdir sənə,***
***Buraxma əlindən ağıl dostunu.***

***İgidin, igidlik tacı dəyişməz,***
***Yüz calaq vursan da acı dəyişməz,***
***Çölü dəyişsə də, içi dəyişməz,***
***Tez eylə başından paxıl dostunu.***

***Demə ataların gümanı yalan,***
***Şöhrətə uyanın imanı yalan.***
***Dost sayma ilqarı, peymanı yalan,***
***Əfsanə dostunu, nağıl dostunu.***

Atanın oğluna bu son dərsiydi,
Onun dada çatan nəsihətiydi.

İlham da xoş bilib o nəsihəti,
Fikrində, işində qətidi, qəti.

Atdığı addımı inamlı atır,
Zəhmətdən yapışıb, arzuya çatır.

Gah Bakıda olur, gah Türkiyədə,
Nəsihəti unutmayır heç vədə.

## EPİLOQ
### *İlahiyə sitayiş*

Şükür kəreminə, ey Uca Tanrı,
Məni nəzərindən salmadın ayrı.

Sən mənə güc verdin Ulu Yaradan,
Sənin köməyinlə mən çıxdım dardan.

Uzaq mənzilimi mən vurdum başa,
Hər an mənim ilə sən oldun qoşa.

Gözümə nur verdin, sözümə qüvvət,
Bu gözəl arzuya yetdim nəhayət.

Sənin fəzilətin ucaltdı məni,
Yatmışdım qəflətdən oyatdı məni.

Sənət meydanına atdı yenidən,
Aldım təb-ilhamı ancaq ki, səndən.

Salavat xətm olsun əhli-beytinə,
Mühəmməd-Əl Mustafanın dininə.

Əziz Allah, bu qüvvəti sən verdin,
Bu tələbi, bu cürəti sən verdin.

Zəka verdin, xoş təb verdin sən mənə,
Susdayanda gülab verdin sən mənə.

Ey dünyanı altı gündə yaradan,
Beş gözəli xoş bir gündə yaradan.

İlham verdin tamamladım əsəri,
Ürəyimin səndən idi hünəri.

O hünərlə mən keçmişə əl atdım,
Çox illəri, əsrləri oyatdım.

Niftalını əsirlikdən gətirdim,
Nəvələri nəvələrə yetirdim.

Söhbət açdım, ərənlərdən, ərlərdən,
Xəbər verdim neçə-neçə yerlərdən.

Əzizdən, Əlidən söhbətlər açdım,
Neçə-neçə el-obalar dolaşdım.

Tanıtdırdım xalqa qəhrəmanımı,
Sən firavan etdin hər bir anımı.

Ancaq pənahdarım sən oldun, Allah,
Məni müşküllərdən sən aldın Allah.

Əlini anaya sən yetirdin, sən!
İlhamı Lenaya sən yetirdin, sən!

Axirət evinə gedənləri də,
Axır mənzillərə yetənləri də.

Sənin məsləhətin apardı, getdi,
Günah dünyasından qopardı, getdi.

Şükür olsun sənin məsləhətinə,
Şükür olsun sənin hər qüdrətinə.

Sən mənim Allahım, mən sənin bəndən,
Nicat diləyirəm yenə də səndən.

***Ya Səyidəs Sədat, mühibbət dəvat,***
***Rafiəl dərəcat, Qabilət təvbat.***
***Vəliyyəl Həsənat, Mütüil Məsəllat,***
***Bir haqqı-ədalət səndən istərəm.***

***Qafiyəl, Səfiat, Səmiyəl, Əsvat,***
***Aliməl, Xəfiyyat, Dafil bəliyyat.***
***Sirdi yaratdığın yer, göy, kainat,***
***Haqq yola hidayət səndən istərəm.***

***Yamən Ləhül izzəti vəl cəmalü,***
***Yamən Ləhül qüdrəti vəl kəmalü.***
***Yamən Ləhül ey Mülki vəl cəlalü,***
***Şan-şöhrət, şərafət səndən istərəm.***

***Ya mən hüvə ey Sariül Hisabi,***
***Ya mən hüvə ey Şədidil İqabi.***
***Ya Hüsnüs Səvabi, İmmül kitabı,***
***Sözümə bəlağət səndən istərəm.***

***Ya zəlmənni vəl bəyani ya Rizvan,***
***Ya Əllahi, ya Səmiyu, ya Furqan.***
***Ya Hənnani, ya Fufranı, ya Sultan,***
***Pak ismət, ləyaqət səndən istərəm.***
***Kərəm həm fəzilət səndən istərəm.***

**5 iyul 2014-cü il**

## BƏS HANI

***Ulu Göyçə mahalının Daşkənd və Bərdə rayonunun Yeni Daşkənd kəndində dünyasını dəyişən sayılıb-seçilən kişilərinə, sənətkarlarına, ismət, ləyaqət, cəsarət sahibi qadınlarına həsr olunur.***

Nə müddətdi axtarıram, tapmıram,
Hatəm ocağının közü bəs hanı?
Aqil ataların, mərd babaların,
Çörəyinin dadı, duzu bəs hanı?

Hanı igidləri ulu Daşkəndin?
Ağılda, kamalda dolu Daşkəndin.
Görünmür heç yandan yolu Daşkəndin,
Enişi, yoğuşu, düzü bəs hanı?

Nağı bəy verməzmiş elin təsivin,
Ağır çəkilərmiş adı Nəsibin.
Seyid Bayram oğlu Seyid Yusifin
Ötkün sözü, nurlu üzü bəs hanı?

Dad çəkərmiş Hacı Balı gəlmədən,
Axund Şəfi tanınarmış kəlmədən.
Xanlar, Həsən çox doluymuş elmidən,
Şirin ləhcələri, sözü bəs hanı?

Dağlar, daşlar yas saxlayır İdrisə,
Min rəhmət yaxşıya, min lənət pisə!
Qoç Alı dağıdıb çox səngər, kilsə
Qannılı Qurbanın izi bəs hanı?

Dindirin Tat Bəhman, Tat Süleymanı,
Şirin söhbətdədi insanın canı.
Meydanda xar edən çox pəhləvanı
Abbasəlinin polad dizi bəs hanı?

Tağı oğlu Məhərrəm, Ağayar, Səfiyar,
Ələmdar, Cəbrayıl çox olub huşyar.
Çox qurub günbəzlər, çox çəkib divar,
Paşaoğlu adına yazı bəs hanı?

Kalvay Əsəd biləkliymiş, eləmi?
Əsədullah ürəkliymiş, eləmi?
Kalvay Əmrah çörəkliymiş, eləmi?
Aşıb-daşan o dənizi bəs hanı?

Mehralı oğlu Məmməd qan-qan deyibdi,
Ziyada çox ellər qurban deyibdi.
Həvil Qasım "getdim zindan" deyibdi,
Kəvərdən Qanlıya izi bəs hanı?

Rzaoğlu Məsim yaddadı, yadda,
Yaxşıda çəkilir adı həyatda.
Bədəl təhsil alıb Leninqradda,[1]
Zər paqonu, zər ulduzu bəs hanı?

[1] Bədəl – Hacı Dünyamalılar nəslindən olub.

Kötük Söyün – qalıb «Kötük dərə»si,
Yanıq Söyün – «Yanıq göl»ü, bərəsi.
Pedi Söyün çəkiləndə nərəsi,
Tutularmış ayın üzü, bəs hanı?

Mədət, Camal qal yatırıb həmişə,
Hacı Kərim əncam çəkib hər işə,
Hüsən bənzəyibdi doğan günəşə,
Qələm qaşı, xumar gözü bəs hanı?

Ocaqverdi eldə olub qlava,
Qocaman xərc üstdə çox salıb dava.
Hacı Söyün düzgünüymüş hesaba,
Görünmür əyrisi, düzü bəs hanı?

Hümbətalı tək götürüb qalağı,
İtib, batıb Mahmud, Hətəm sorağı.
Əkbərov Qasımın hər otarağı,
Çəmənliyi, gül-nərgizi bəs hanı?

Hacı Rəhim – Rüstəmi-Zal, cahangir
Tədbirdə pir Qorqud, döyüşdə bir şir.
Hünəri elm ilə olubdu əlbir,
Xəncərinin iti üzü bəs hanı?

Məşədi Qasım igid olub hər yanda,
Hünərlər göstərib o, Əsgəranda.
Məşədi Məmməd – təmiz dində, imanda,
Bayramın o şux avazı bəs hanı?

Məmməd oğlu Xıdır, Hacı Allahverdi,
Səxavətdə birdi, hörmətdə birdi.
Gözlərim həmişə karvanda gördü,
Namazdının o Namazı bəs hanı?

Əmirzada sayılarmış nəsildə,
Baba oğlu Abdulla əzbərdi dildə.
Əzizlənib Abduləli hər eldə,
Qaravaşı, qul-kənizi bəs hanı?

Qanlıdan gəlibmiş bil, Bayraməli
Daşkəndi özünə yurd seçib, bəli.
Usubu aparıb Hitler əməli –
Özgə üç Usubun izi bəs hanı?[1]

Dərzi Səfər loğman, alim olubdu,
Çılpaq Bayram kövrək, həlim olubdu.
Şair təbli Aslan, Əlim olubdu,
Yazdıqları şeir, yazı bəs hanı?

Koyxa olub Abbasəli bir zaman,
İslam, Möhsüm gözə dəymir, ay aman!
Qara köynəyində pas atıb qalan,
Muxayılın, İslamın sazı bəs hanı?

---

[1] Usuf Abdullayev müharibədən qayıtmayıb. Digər üç Usuf isə – Usuf Əsgərov, Usuf Mürsəl oğlu və Usuf Bayram oğludur.

Qərib Abbas çəksin həzin bayatı,
Duyub düşünmüşəm fani həyatı.
Kalvay Məhəmmədin, Abbasın atı,
Çapardan qayıdır, tozu bəs hanı?

Eldə olub çox hörməti Mürsəlin,
Dosta olub məhəbbəti Mürsəlin.
Bir kök olan Temir, Yavıx, Rəsilin,
Bol nəziri, bol niyazı bəs hanı?

Ovçuluq gözəldi – Pirimdən qalıb,
Rəhim, – oğlu Əfqan göydən ov salıb.[1]
Əli, Pənah, Bəhman çox nişan alıb,
Avılın durnası, qazı bəs hanı?

Baxmayaraq soyu yaxşı soy olub,
Kalvay Abbas, Kalvay Hacı göy olub.
Kalvay Qurban qənaətlə öy olub,
Çoxu qalmayıbsa, azı bəs hanı?

Sənətdə mahirmiş Behbut, İsmeyil,
Abbasəli, Tapdıq çox salıb meyil.
Kərənti çəkməkdə Nədir və Cəmil,[2]
Dizinin tumaşı, bezi bəs hanı?

---

[1] Məmmədsadıqov Rəhim
[2] Nədir Qədirlilərdən, Cəmil İsmayıllılardandır.

Səxavətdə Hatəm olub Başxanım,
Göyərçin deyəndə titrəyir canım.
Xuramanla gedib dinim, imanım,
Gülüstan tək dan ulduzu bəs hanı?

Arif olub Hacı oğlu Süleyman,
Həmid, Şəmil nakam getdi, ay aman!
Sarı Söyün ürəklərdə bir güman,
Balışın utancaq üzü bəs hanı?

Mehdi, Murtuz dilə gəlir yüz kərə,
Qəfəs Abbas od qalayıb Tərtərə.
Axırında bənzər olub sərsərə,
Adı çox anılır, özü bəs hanı?

Məhəmməd, Cavanşir, Rəşid, Müslüm,[1]
Aşıq Firuddin tək şeyda bülbülüm.
Siz Qara Orucdan söz açın, bilim,
Şəmilin o huşyar gözü bəs hanı?[2]

Kalvayı Süleyman və oğlu Hacı,
Xəlilin çəldlikdə olubdu tacı.
Məcidə taleyi baxıb qıyqacı,[3]
Buz bağlayan dil-ağızı bəs hanı?

---

[1] Müslümü ildırım vurmuşdu.
[2] Əliyev Şəmil Hüseyn oğlu
[3] Məcid Hacı Rəhim oğlu

Salatın kişi tək oturub, durub,
Cəvahir çatmaynan igidlər vurub.
Şəhri yaylaqlarda nişangah qurub,
Dərəsi məlumdu, düzü bəs hanı?

Leylan, Ayna Ay doğulub anadan,
Bibixanım seçilməyib sonadan.
Yasəmənin saçı çıxıb cunadan,
Qədəminin pəyəndazı bəs hanı?

Harda qaldı loğman Zeynəb, Xeyransa,
Züleyxa pir olub, ariflər qansa.[1]
Fatimə bir yandı, hamı bir yansa,[2]
Ədası, işvəsi, nazı bəs hanı?

Belə qərar qoyub qadir yaradan,
Gec-tez bəşər əhli çıxır sıradan.
On versdən ayıran ağı qaradan,
Abbasəlinin iti gözü bəs hanı?

Qonaq-qaralıydı Məhərrəm kişi,
Əsəd, Fərrux asta tutarmış işi.
Sayadın, Hüseynin o şax yerişi,
Koroğlunun soyuq üzü bəs hanı?

---

[1] Züleyxa Hacı Balı qızı
[2] Fatimə Əsəd qızı – Leylanın nəvəsi

Qoruqçu Babışın gələndə səsi,
Təngiyərdi çobanların nəfəsi.
O, Bığlı Əsgərin hər bəhsə-bəhsi,
Almanlarla söhbət, sözü bəs hanı?

Qara Söyün, Məsim, Cəmşid, Qara Əziz,
Dövlətdən bol olub, ürəkdən təmiz.
Cənnət olub Göyçə kimi yerimiz,
Qantəpəri, ələyəzi bəs hanı?

Qoçaq olub Qara Məmməd deyirlər,
Ağır yaralanıb Hümbət deyirlər.
Kalvayı Məsimə rəhmət deyirlər,
Susdurarmış çox dinsizi bəs hanı?

İsfəndiyar, Şaban, Yunis, Hidayət,
"Qızılhacıllı"da baş imiş əlbət.
Nənəş oğlu Məhərrəmə min rəhmət,
Hasanqulunun xırman tozu bəs hanı?

Aşıq Nəcəf olub sənətdə qəvvas,
Ziyaddan, Surxaydan qalıb xoş avaz.[1]
Zurnada heç kimsə Mehbalı olmaz,
Hidayətin telli sazı bəs hanı?

"Babalar"da bir Hətəmxan olubdu,
Əhməd kişi huşyar insan olubdu.
Ağakişi yaxşı çoban olubdu,
Bəslədiyi qoyun, quzu bəs hanı?

---

[1] Ziyad və Surxay aşıq olublar.

Vaqif müəllim, hanı o gözəl çağlar,[1]
Düşündükcə gözüm qanlı od ağlar.
Məhərrəmi bada verdi o dağlar,
Qiyasın qəlbinin buzu bəs hanı?

Zeynalabdı, Papır müəllim tez getdi,
Tale Göyüş, İsgəndərdən üz getdi.
Şükür kişi niyə belə üz getdi?
Heç yoxlamır qəlbimizi bəs hanı?

Məsəli var dil-dodaqda Hasanın,
Gülməmmədin – o, baməzə insanın.
Pas atıbdı kərəntisi Qurbanın,
Qədirin bülövü, bizi bəs hanı?

Alı nə apardı dünya barından?
Səttar da ayrıldı öz dildarından.
Kalvayı Rüstəmin ümman varından,
Bol nəziri, bol niyazı bəs hanı?

Rəsil, Hacı Kərəm, İsmeyil, Xanış,
Dünyanın sirrindən olgınan tanış.
Keçmişə əl atdım mən qarış-qarış,
Əllisin sanadım, yüzü bəs hanı?

Tat Kərimin dəyirmanı, xizəyi,
Şirinin, Gülgəzin farmaş-gözəyi.

[1] Abdullayev Vaqif Mirzə oğlu

Mansır oğlu Abbas toylar bəzəyi,
Məclislərin oyunbazı bəs hanı?

Qoy ağlasın Fatma, Şahlıq, Allahman,
Həcər desin – “Getdi təzə Süleyman”.
Hurimələk dil deyərmiş nə yaman,
Nənəşin nisgilli sözü, bəs hanı?

Tağı oğlu Məhəmməd, Nəbi, Abdullah,
Aqibət günündən sən saxla, Allah!
Bəşir, Abduləli dildə bismillah,
Söhbətinin çoxu, azı bəs hanı?

Kalvay Qasım, Kalvay Zeynal, Kalvəli,
Xıdır, Qasım söz-söhbəti məzəli.[1]
Əliyev Söyünün bəydi əzəli,
Nübarının baş naznazı bəs hanı?

Yaddan salma İbrahimi yad elə,
Namaz düşdü yad torpağa, yad elə.
Sayad saldı yaxşı hörmət, ad elə,
Hüseynin o gül bənizi bəs hanı?

Tutdu qəza Həsənxanı, Şəmşədı,
Zülfüqarın məktubu da gəlmədi.
Cəmildən bir soraq kimsə bilmədi,
Xankişinin duzlu sözü bəs hanı?

[1] Namazlının Qasımı

Qoy Şahnazar oğlu Hasandan deyim,
El-oba gərəyi insandan deyim,
Ocağına gələn gümandan deyim,
Səcdəgah o daşın, izi bəs hanı?

Ovu gedir nə bəd yolla Mehdinin,
İşi yoxmuş qalmaqalla Mehdinin.
Molla Avdısöyünün, Molla Mehdinin,
Şabanın gül ceynamazı bəs hanı?

Ən kövrək, ən həlim Müzəffər olub,[1]
O iki Böyükkişi rəncbər olub.[2]
Yetim Həsən boyda şiri-nər olub,
Bəyişin, Əlinin üzü bəs hanı?[3]

Dəllək Cabbar, Cabbarlının Cəlili,
Halal tutub mayasını hər ili.
Tağı İsmayıl oğlu, həm Çıraqəli,
Canbağışın əkin düzü bəs hanı?

Tat oğlu Abdulla, İbrahim, Lətif,
Vaxtsız köç etdilər, heyif, min heyif!
Muradın həsrəti çox qəddi əyif,
El-obanın üç Əzizi bəs hanı?[4]

---

[1] Müzəffər Bəyiş oğlu
[2] Böyükkişi Qocamanov və Böyükkişi Bədəlov
[3] Əli İmamqululardandır.
[4] Əliyev Əziz, Abbasov Əziz və Bayramov Əziz.

Tahar, Bayram, Medoş, Himoy, Abdulla,
Oruc, Cəmşid, Calal getdi bu yolla.
Çox meydan alıbdı Elləz tək qolla,
Otardığı qoyun-quzu bəs hanı?

Adın çək Əmralı, Qəmbəralının,
Bayramxan, Əsgərxan, Tanrıqulunun.
Bir qazan xəngəli yeyən Culunun,
Dolayı saldığı cızı bəs hanı?

Seyid İsmayılı gözümlə gördüm,
Çox ziyarət etdim, çox nəzir verdim.
Keçən keçmişləri gözə gətirdim,
Adların sanadım, özü bəs hanı?

Usta Mahmud, oğlu Abbas, Kor Vəli,
Rəncbərmiş Sadıq, Əvzər həm Əli.[1]
Cahangirlər olub kotan məjgəli,
Hodağı, əkini, düzü bəs hanı?

Allahverdi uca boylu olubdu,
Əli, Mədət nakam toylu olubdu.
Məhəmmədlər yaxşı soylu olubdu,
Axtarıram beymurazı bəs hanı?

Talıbın, Mirzənin şirin dilləri,
O, şəhid Muxtarın solğun gülləri.[2]

---

[1] Həzrətqulu oğlu Əli
[2] 1918-ci ildə şəhid olan Muxtar Hacı Kərim oğlu

Şamoylunun, Koralların Əsgəri,
Yanaqları hicran bozu bəs hanı?

Cəmşidov Yusifin ömrü qaranlıq,
Hamlet həsrətinə necə dayannıq?
Çobanların çörəyinə yavanlıq,
Bulaqların buz yarpızı bəs hanı?

Tomu oğlu Yunus, Qaraş, həm Abbas,
Gedəndə aləmi çulğadı qəm, yas.
Musayev Elbəyi, Nərman qulaq as,
İslamın o, üç şahbazı bəs hanı?

Mövzu yazılanda sağıydı Xasay,[1]
Elə arxa idi, dağıydı Xasay.
Dost yanında üzü ağıydı Xasay,
O, təsifkeş el əvəzi bəs hanı?

Gör neçə qapılar qalıbdı bağlı,
Tağı bəy, Mürsəl bəy, yarlı-yaraxlı.
Məşədi Abdulla, Oruc Balı oğlu,
Yanaqları al qırmızı bəs hanı?

Topal Salman, Sarı, Məhəmmədəli,
Xanbaba, Müseyib igidlik əli.
Xıdır, Qədimalı, Mursaqul, Alı,[2]
Elin Qoşun, o sərbazı bəs hanı?

---

[1] Hacıyev Xasay Oruc oğlu
[2] Koralların Xıdırı

Məktəbdən yarımçıq getdi İsmixan,
Qara Nəsib, Avdıləzim, Xanoğlan.
Albaba, Ələkbər, Ellərdən qalan,
Qələm, dəftər, o kağızı bəs hanı?

Ağlamışam Mehbalıya, Səhraba,
Yas saxladı Daşdəmirə bir oba.
Cəlil sağlığında batıb səvaba,
Bahadurun duzlu sözü bəs hanı?

Qurbanlar, Əlilər, Əvzərlər gedib,
Salahlar, Pənahlar çox ərlər gedib.
Məhəmmədlər gedib, Əsfəndlər gedib,
İnsanlığın dadı, duzu bəs hanı?

Səfər oğlu Yunus, Səlim, Süleyman,
Cubboy Söyün, Kərəm anılır hər an.
Ağaməli, İmaməli, Qəhrəman[1]
Heydərin o zurna, sazı bəs hanı?

Var-dövlətli olub o, Ömürvalı,
Möhsüm, Abbasəli, huşsuz Niftalı.
Çoban Xıdır qəfil tapdı zavalı,
Elin Safoy, o Elyazı bəs hanı?

Xanbuta, Şahsuvar, Əli Zağalı,
Səfxan müəllim vaxtsız tapdı zavalı.

---

[1] Babaların Qəhrəmanı

Asdan, Şəmistanın cahı-cəlalı,
Cabbarlının de Şahbazı bəs hanı?

Deputat Müslümlə, “Masnaget Nəsib”,[1]
Zərbəli, Yadigar, Məzahim təbib.
Məmmədrəhim ilə Əsədov Həbib,
Söz-söhbəti o, baməzə bəs hanı?

Orta boylu Şəmistanlar görünmür,
Zülal, Bilal, nə Hilallar görünmür.
Xasay, Surxay, Əmirxanlar görünmür,
Zal oğlu Bayram, Eyvazı bəs hanı?

İsa, İbat, Ənvər, Ələddin, Çingiz,
Bayram Vəli oğlu, Köçəri, Əziz.
Ələkbərsiz evlər qalıb keçəsiz,
Elin alim o Novruzu bəs hanı?

Həlim təbiətli Dastan, Abdulla,
İşləri olmazdı sorğu, sualla.
Hüseynqulular getdi bu halla,
Hacının döşündə sazı bəs hanı?

Babış oğlanları Bayram, həm Oruc,
Dünyanın tamından daddı bir ovuc.
Əcəl çatdı, dedi: – gəl torpağı quc,
Qənəhət tək beymurazı bəs hanı?

[1] Masnaget Nəsib – tütün briqadiri

Bol süfrəli, səxa əlli Tavariş,
Özün gördün nələr etdi bu gərdiş.
Növbə Avdılxana, Mehmana yetmiş,
Hümbətin, Binnətin izi bəs hanı?

Saray idi Məhəmmədin zağası,
Xəyal oldu qarazurna havası.
Uşaqların “Papaq getdi” davası,
Cavanların qumarbazı bəs hanı?

Sultanın evində qanı dayandı,
Sabirin, Qoşqarın canı dayandı.
İsmixanın dəyirmanı dayandı,
Eldən gələn çörək, ruzu bəs hanı?

Əzimov, Kərimov Bəxtiyarlar yox,
Nəbi kimi sözə xiridarlar yox,
Yoxdu Balabəy tək sənətkarlar yox,
Asifin, Əlxanın izi bəs hanı?

Tanrıverdi, Tapdıq elə sərkərdə,
Bir mahala həm pənahdar, həm dədə.
Misir, Ramazan da getdi beyvədə,
Həsənin fəlsəfi sözü bəs hanı?

Abbasəli, Mehdi, həm Dünyamalı,
Qaldı övladlara cahı-cəlalı.

Qəhrəmanın nağarası havalı,
Məhəmmədəlinin izi bəs hanı?[1]

Müqəddəs pir idi Qəzənfər, Əli,
Haqqın ətəyindən tutmuşdu əli.
Nohəxan Qəşəmin təmiz əməli,
O, Qəmgin Fəzinin sazı bəs hanı?

Hanı Müxtər, hanı Bəylər, Məzahim,
Mirzə kişi oğlu Yaqub, daha kim?
Naxçıvanlı Əsəd, həm Müslüm müəllim,
Yamiddin, Fəxrəddin özü bəs hanı?

Bayram, üç oğulu – Möhsüm, Rəşid,
Namaz müəllim, İslam, Qiyas, həm Xalid.
Tahar oğlu Qurban elə bir kilid,
O sərt üzü, ötgün sözü bəs hanı?

Tat İsmayıl, Xasay, Əlif, Qələndər,
Əlidən, Əyyubdan tutgunan ətər.
Çox oynağan idi Məcnunla Müxtər,
Saydıqları qoyun, quzu bəs hanı?

Ələkbərov Bəylər, həm də Ələsgər,
Fərman, Salman, Sahib – kökdən üç nəfər.
Şiraslan, həm Kamran, balaca Bəndər,
Bahəddinin cavan üzü bəs hanı?

[1] Məhəmmədəli – Hacı Məhəmmədlilərdən olub.

Getdi Dəmir, Qurban, Sabir, Məhərrəm,
Siyavuşa rəhmət deyin min kərəm.
Mömün idi Esabalı deyərəm,
Nazim, Nizaminin özü bəs hanı?

Səs saldı hər yana Molla Əmirxan,
Xeyriyyəçi Lətif yaddadı hər an.
Söz demir Alqayıt, dinmir Arzuman,
O, Aşıq Bayramın sazı bəs hanı?

Bayramov, Əsədov İbrahim müəllim,
Siz yoxsuz deməyə gəlməyir dilim.
Gülalı, İsmayıl, Mətiş nə bilim –
Zeynalov Adilin izi bəs hanı?

Abdullalar gedib, Əkbərlər gedib,
Gör neçə Əlilər, Əsgərlər gedib.
Bayramlar, Vəlilər, Əzizlər gedib,
Qanıbəyin gülər üzü bəs hanı?

Əliş, Paşa, Heydər bir kök, bir qoldu,
Ay Ayaz, Baxşəli varaqlar doldu.
Qəşəm İsmeyilə köməkçi oldu,
Kömürü, körüyü, pazı bəs hanı?

Baməzə Zülfalı, Qırış görünmür,
İsbahat etdiyi yarış görünmür.
Möhübbət vurduğu naxış görünmür,
Ağac üstdə bər-bəzəyi bəs hanı?

Qara Tofiq, İmran, Zakir, Müstəcəb,
Rüstəm, Elbəyi, İsmayıl, Nəcəf.
Tat Salman söhbətə başlayıb əcəb,
Məclisin ozanı, sazı bəs hanı?

Nakam getdi Fəxri, Murad, Rəhman,
Bolu oğlu Aqşin, Emintək cavan.
Şeir söyləyərdi Seyfəddin yaman,
Küsgün getdi, sərvinazı bəs hanı?

Zahid, Dəli Yaqub, iki Qənimət,
Bir kənddən gedibdi səkkiz Məhəmməd.
Dünyada qalandı çəkilən zəhmət,
Arifin, Nəcəfin izi bəs hanı?[1]

Seyid ocağından Məhəmmədəli,
Seyid Mirağanın təmiz əməli.
Məsimin xoş idi ilki, əzəli –
İki oğlu, cüt şahbazı bəs hanı?

Xasay Zeynalovtək şairlər gedib,
İsrafil kişitək nəsillər gedib.
Fəxrəddin, həm Fazil, Fərmanlar gedib,[2]
Osman kimi beymurazı bəs hanı?

[1] Arif Böyükkişi oğlu və Nəcəf Ziyad oğlu
[2] Alıyev Fərman və Yunus oğlu Fərman

Vəzir, Xallı Nəbi, həm İmaməli,
Talıb Sayad oğlu, həm Abbasəli.
Şikarı apardı qəzanın əli,
Zamanın qürbətdə izi bəs hanı?

Usta Yaqub, Mirzə, Sarı Zülfüqar,
Həşimov Əmirxan tez tapdı azar.
Ay Saday, dünyaya gəlməyə nə var,
Dünyadan gedənin izi bəs hanı?

Mən burda seçmədim yaxşı, yamanı,
Allah özü verir hər bir fərmanı.
Mən burda yazmadım şəhid olanı,
Onlardan haqq yazıb, özü bəs hanı?

Bir kökdən yox oldu – Dilqəm, Müzəffər,
Şuxu, Abıd, Zabıd gör neçə nəfər.
Əkbərin də ömrü oldu beyhədər,
Suliddinin şirin sözü bəs hanı?

Bayramov Abdulla, Papır, Məhəmməd,
İkram, Köçəriyə, Əliyə rəhmət!
Əyyub, Əfsəl, Möhsüm, Kərəm, Əbülfət,[1]
Musa kimi şeirbazı bəs hanı?[2]

Qoca, – Musa oğlu, Mikayıl hanı?
Gəzirəm Ədili, həm Ramazanı.

[1] Əhmədov Kərəm
[2] Musa Möhsüm oğlu

Rəsilin, Əsgərin tamam dördyanı,
Biçənəkdə göy toppuzu bəs hanı?

Tamam, Gülsüm, Maral, Səkinə, Sədət,
Seyid Bayram ağa bizlərə həsrət.
Duyub düşündükcə dəhşətdi, dəhşət,
Seyidlərin göy günbəzi bəs hanı?

Dillər laldı Azadxandan ötəri,
İlyas, Bakir şux cavandan ötəri.[1]
Nəbi kimi gövhərkandan ötəri,
Soldurmuşam ay bənizi bəs hanı?

Balış oğlu Cəmil, Xasay, həm Qara,
Nurəli, Viləddin, – çatdım gör hara.[2]
Xıdır, Kərəm, Əsəd o qardaşlara,
Gəncəli həm o, Şahbazı bəs hanı?

Xıdır oğlu Mamed, İsmeyil, Qurban,
İsmayıl, Təvəkkül, İslamdı bir can.
Seyid Əli qərib köçdü dünyadan,
Oda atıb könlümüzü bəs hanı?

İmansız dünyamı bürüyübdü hiss,
Hər sözü-söhbəti əzizdən əziz.
Yaqub Hacıyevtək – alim, mühəndis,
Hacı Rəhimtək molla, qazı bəs hanı?

---

[1] İlyas Rəhim oğlu və Bakir İsmeyil oğlu.
[2] Nurəli Əli oğlu və Viləddin Xanputa oğlu.

Zamaxan, Qardaşxan, Əmirxan, Məcid,
Dünyamalı vurub sənətə kilid.
Məhəmməd, – ustad var, dizini bərkit,[1]
Cəmi ozanların sazı bəs hanı?

Molla Şaban, Mehdi, Abuzər getdi,
Molla Canbaxışda xoş nəzər getdi.
O Molla Abbasda çox kəsər getdi,
Həsən Xəyallıdan yazı bəs hanı?

Uzaq mənzil keçib, gəldim yaxına,
Nəbi Qurban oğlu düşdü axına.
İsaq, Qismət yetdi qəza oxuna,
Xansuvarın odu, közü bəs hanı?

Xıdır oğlu Oruc elə bir ürək,
Belə yazılıbmış tale nə demək.
Pəri ana kimi yaralı, kövrək,
Pir, müqəddəs oğlu, qızı bəs hanı?

Dastanlara düşə bilməz hər kişi,
Cabbarlıda Hünbət kimi pir kişi.
Şiruyələr necə gördü gərdişi,[2]
Əkbər elin beymurazı bəs hanı?[3]

---

[1] Qaraş oğlu Məhəmməd.
[2] İmanov Şiruyə və Zeynalov Şiruyə
[3] Əkbər Müzəffər oğlu

Qarasöyünlüdən baba Məhərrəm,
Abdulla anılır bəlkə min kərəm.
Teztəb idi İmaməli deyərəm,
Həmdəmin ustalıq izi bəs hanı?

Nəbi Hüseyn oğlu, Dımış İbrahim,
İsmeyil, Orucəli, Misir, daha kim?
Bayraməli olub baytar bir həkim,
Bəslədiyi qoyun-quzu bəs hanı?

Dəli İsbi, Usta İsbi, üç İsbi,
Əcəl gəldi, dedi: eylə köç, İsbi.
Əməlini bu dünyada aç, İsbi,
Haqq deyəcək çoxu, azı bəs hanı?

Kəkoy Məmməd, bir də kəkoy Süleyman,
Mirzəni apardı Hitler beyiman.
Dəllək Oruc, Alı, o Manaş – Fərman
Çöpük Söyün, – izi-tozu bəs hanı?

O Çöpük Söyünün oğlu Xıdır da,
Viləddin, Sürəddin, nakam Sərdar da.[1]
İsmayıl axirət bir ixtiyarda,
Onlardan nişanə yazı bəs hanı?

Başkəndli Qarayla, Alçalı Bilal,
Həmən bu Daşkənddə qurub cah-cəlal.
Xalıqverdini də tez tapdı zaval,
El də bilmir oğlu, qızı bəs hanı?

---

[1] Viləddin Xanputa oğlu, Sürəddin Qurban oğlu və Sərdar Murtuz oğlu

İsrafil – oğulu – Zahid və Sədi,
Nemət müəllim getdi, yer-göy göynədi.
Rəhim[1] məclislərdə şeir söylədi,
Topladığı, dastan, yazı bəs hanı?

İslam Söyün oğlu yurdu dəyişdi,
Doğma obasından aralı düşdü.
Hacı qocalıqla çətin ötüşdü,
İsoy, – elin şeirbazı bəs hanı?

Yaddan çıxmaz Camal oğlu Albaba,
Həlim, xoşniyyətli olan bir baba.
Şıltaq Namazəli çatdı hesaba,
Çingizin de əyri, düzü bəs hanı?

Yetim Maarif zillət çəkdi nə qədər,
Eldarın da ömrü tez getdi hədər.
Saydım kişiləri axır bu qədər,
Elin neçə sərvinazı bəs hanı?

Fikri dayaz mətləbimi az anlar,
Eh, nə çoxdu sözü tərsə yozanlar.
Uzun, gödək Abbasəli – ozanlar,
Şairlinin o, Novruzu bəs hanı?

Uçmuş könül evim yapa bilmirəm,
Həsrətim sal qaya – çapa bilmirəm.
Ürəyim istəyir tapa bilmirəm,
Şoşan, qımı, ya qoşquzu bəs hanı?

[1] İsmayılov Rəhim nəzərdə tutulur.

Bəlkə yaddaşımdan çıxanlar oldu,
Könüllər yandırıb, yaxanlar oldu.
Mənə tərsə-tərsə baxanlar oldu,
Giley-güzar, söhbət-sözü bəs hanı?

Hasoy əmim yaxşı batdı savaba,
O dedi mən yazdım, budur kitaba.
Bir gün də deyəcək bu el, bu oba:
Şiruyədən qalan yazı bəs hanı?

***

İndi söz sizindir, əziz cavanlar,
Bizdən sonra bu dünyada qalanlar.
Qoymayın ortaya düşə yamanlar,
        Övladısız bir torpağın, bir suyun,
        Yadlar girə ortalığa qoymuyun.

Əl-qol atın, darda, gendə bir olun,
Hər əməldə, hər amalda pir olun.
Özgələrə açılmayan sirr olun,
        Birləşin ki, yadlar sizi əyməsin,
        Qəlbinizə bir kimsənə dəyməsin.

Unutmayın babaları siz Allah,
Ataları, anaları siz Allah,
Eyləməyin xataları siz Allah,
        Bir bəd kəlmə adınıza gəlməsin,
        Dərdinizi bir özgəsi bilməsin.

Bacarsanız dost eyləyin düşməni,
Siyasətlə süst eyləyin düşməni.
Süfrə açın, məst eyləyin düşməni,
Əl atmayın yersiz-yerə silaha,
Hər bir işdə siz sığının Allaha.

Axirətə gedənləri yad edin,
Hər cümədə ruhlarını şad edin.
Məzarını ziyarətlə yad edin,
Dörd yanına əkin lalə, qərənfil,
Unutmayın, bunu edin hər fəsil.

Göyçəm viran qalıb, köçkünəm özüm,
Dizimdə taqət yox, canımda dözüm.
Ay nəvə-nəticəm, ay görən gözüm,
Oxuyun, tarix tək əsərlərimi,
Görün bu sənətdə hünərlərimi.

Düşsə güzarınız Göyçəyə əgər,
Deyin inləmişəm onsuz nə qədər.
Ay Şiruyə, vəsiyyətin ta yetər,
Sözlərini ümid ilə tamamla,
Vidalaş, get, axirətə inamla.

# ŞƏHİD QƏBİRLƏRİ

Al-əlvan çiçəklər, qırmızı lentlər,
Burda bəzəyibdi cansız daşları.
Burda cərgələnib ərgən igidlər,
Yatır bu millətin qan qardaşları.

Hər məzar, başdaşı bir ünvan verir,
Hər mərmər başdaşı alboma dönüb.
Baxıram, baxıram yaram qan verir,
Bir gör neçə-neçə ocaqlar sönüb.

Dağ boyda qüdrəti olan igidlər,
Necə də sığışıb bir dar məzara.
Hünəri tarixdə qalan igidlər,
Yetməyib bu günkü xoş arzulara.

Hər elin-obanın məzarıstanı,
Şəhid qəbirlərlə məbədlənibdi.
Neçə anaların ümid-gümanı,
Üz çevirib bu məbədə gəlibdi.

Bax bu da bir elin məzarıstanı,
Bu da cərgələnən igid şəhidlər.
Mən deyim onları sən bir-bir tanı,
Gör nələr söyləmir bu xatirələr.

Qayıtdı Yasifin nişan üzüyü,
Bağlı boxçadadı o vaxtdan bəri.
Bax budur, bax budur dərdin böyüyü,
O vaxtdan qurumur ana gözləri.

Şəhid cərgəsinin başında durub,
Od içində qalan polis Ziyafət.
Görən hansı qızdı boynunu burub,
Hansı bir ürəkdə susdu məhəbbət.

Aylar illər keçir, bu müşgül sual,
Bir düyünə dönüb açılmır hələ.
Bəlkə açılsaydı bu şirin xəyal,
Təsəlli olardı böyük bir elə.

Bu da ellər oğlu nər Eldənizdi,
Arşın oğlu dirək soy kökündəndir.
Dağ kəlini yıxan ər Eldənizdi,
Polad ürək, bilək soy-kökündəndir.

Taleyi qaralı kapitan Cəfər,
Qaldı tarixlərdə adın, hünərin.
Olmadı nə anan, nə atan, Cəfər,
Can deyib ağladı səni ellərin.

Qar-boranda qalan yaralı Ziya,
Ellər söhbət açır cəsarətindən.
Cəsəti elindən aralı Ziya,
Atan da köç etdi bu həsrətindən.

Ay böyük amallı «balaca» Qulam,
Neçə tanklar yıxdı qrantamyotun.
Adın çəkildikcə el deyir: – Balam,
Oyanın, təzədən nişangah tutun.

Bax bu da Firudin – qələm-qaş oğlan,
Vətənə canını qurban eylədi.
Döşünə sıxdığı avtomatıyla,
Düşmənin bağrını al-qan eylədi.

Bu da nur çöhrəli Elçinin qəbri,
Budur görüşünə gəlib bir gəlin.
Necə böyük imiş qəzanın cəbri,
Ayırdı sevgidən sevginin əlin.

İki məzar yeri boş qalıb burda,
Kaş güman gülləri ləçəklənəydi.
Müjdəçi gələydi bir gün bu yurda,
Hicranlı könüllər çiçəklənəydi.

İtgin Rəşadət, itgin Mehdimiz,
Qayıdıb gələydi doğma vətənə.
Tanrıya xoş gələ kaşki əhdimiz,
Şükürlər edəydik biz dönə-dönə.

Bu da Məhərrəmin bəzənmiş qəbri,
Oğul, qız əliylə bəzədilibdi.
Bu dərdə dözmədi atanın səbri,
Axirət evinə o da gəlibdi.

Bax bu da Rəsul, bu da son şəhid,
Bu da on ikinci, sayımın sonu.
Cəsus əməlləri vurdu bir kilid,
Metroda partlayış apardı onu.

Yenə bir-bir baxıb vidalaşıram,
Ziyarət edirəm bu qəbirləri.
Qəlbi dərdli-dərdli uzaqlaşıram,
Hələ gəzməliyəm neçə elləri.

Bu da qaçqın düşən Göyçə Daşkəndi,
Bakı şəhərindən başqa on səkkiz,
Rayonlar bölübdü həmən bu kəndi,
İndi hansı yana üz çevirək biz?

Hansının qəbrini harda axtaraq?
Fəxri xiyabanda, ya bölgələrdə...
Hansı qəbristandan biz tutaq soraq,
Yox, yox onlar deyil yad ölkələrdə.

Bu vətən uğrunda şəhid olublar,
Vətənə şöhrətdi qəbirləri də.
Hər biri yenilməz igid olublar,
Tarixə yazılıb hünərləri də.

Fəxri xiyabanda Tofiq uyuyub,
Soyadı Qocaman, Əsədxan oğlu.
Yaddaşlarda böyük bir hikmət qoyub,
Vətən ilə şərik ürək, can oğlu.

Abbası Samuxda ziyarət etdik,
Abbas Talıb oğlu – babası Qasım.
Bir hünər dalınca yol alıb getdik,
İgid babasına çəkmiş Abbasım.

Göyçənin ikinci qaçqınlığında,
Hünərlər göstərmiş Məşədi Qasım.
Ağdamın Əsgəran yaxınlığında,
Düşməndən çox qırmış Məşədi Qasım.

Bakının Şəhidlər xiyabanında,
Uyuyub Nurəddin Əmirxan oğlu.
Göyçə həsrətini hər an canında,
Yaşadıb kamalda pir insan oğlu.

Arzusu, istəyi bağlı bir boxça,
Sevgisi qönçəkən açmamış solub.
Vətənə sevgisi hər şeydən uca,
Vətən uğrunda da o, şəhid olub.

Nəbiylə Quşçuda görüşürük biz,
Qəbir hər tərəfdən bürünüb gülə.
Bu məzar daşıyla öpüşürük biz,
Baxışlar bizləri tutubdu dilə.

Bax Nəbi Zeynalov yazılıb daşa,
Atası Surxay da köçüb dünyadan.
Burda ata, oğul verib baş-başa,
Sanki, dərs götürür oğul atadan.

Göyçənin ikinci qaçqınlığında,
Şəhidliyə yetib gör neçə nəfər.
Zamanın o vaxtkı çaşqınlığında,
Nələr eyləməyib erməni kafər.

Belinə bağlanıb qaynar samovar,
Belə şəhid olub bax, Aşıq Nəcəf.
Diri-diri basdırılıb uşaqlar,
Beş oğul ölümə qoyulub hədəf.

Şəmsəddin, Şəmistan, Mikayıl, Aslan,
Beşinci sonbeşik, körpə İsmayıl.
Söylənir bu sitəm hər zaman, hər an,
Eşit bu zülümü müsəlman, ayıl!

Beş oğul anası olan Gülüstan,
Bir də iki gəlin intihar etdi.
Belə etməliydi qeyrəti olan,
Onlar şəhidliyə bax belə yetdi...

Selikovun başın kəsən Hacı Rəhim,
Oğlu Əsədullah, kəndlisi Muxtar.
Şəhid olub, tükənibdi hünərim,
Hələ də çəkirik belə qəm-qübar.

Ölkədə elə bir el-oba yoxdur,
Orda şəhid qəbri olmaya, Allah!
Sənin hər qüdrətin, kərəmin çoxdur,
Elə et tər güllər solmaya, Allah!

# RZALILAR NƏSLİ

Ulu diyar, doğma Göyçə mahalı – əbədi olaraq ədəbi mövzumuza çevrilən yurd. Nə tarixin bəllidir, nə də yaşın. Əslində yaşını da, tarixini də bilirik. Sənin yaşın YERin, GÖYün yaşıdır. Günü bu gün də səni araşdırır, səni öyrənir, səndən yazırıq. Zaman-zaman adını dünyaya car çəkən, səni külli-aləmə tanıdan ozanların, şairlərin, nəsillərin oldu.

...Bir-birindən gözəl kəndlərin sinən üstə olan gömgöy gölünün – səninlə adaş olan gölünün ətrafında üzük kimi çevrələnmişdi. Bu kəndlərin hər birinin öz gözəlliyi, öz özəlliyi vardı. Bu sətirləri yazdıqca kövrəlir, uşaqlıq illərimə, sənli günlərimə qayıdıram. Yaylaqlarını, yurd yerlərini, dağlarını, dərələrini, güneylərini xatırlayıram.

...Sakinlərin də özün qədər əzəmətli, özün qədər dəyanətli, sevimli idi. Qoynunda neçə-neçə qərinələrə yoldaş olan nəsillər yurd salmışdı. Bu nəsillərdən biri də Rzalılar nəsli idi.

2005-ci ildən başlayaraq Daşkənd kəndində yaşayan nəsillər haqqında araşdırmalar aparır, məqam olduqca tamamladığım materialları müxtəlif kitablarda çap etdirirəm. Belə bir məqam da indi yaranıb. Nə yaxşı ki, Sərraf Şiruyə Daşkəndin sayılıb-seçilən ağsaqqallarından olan Kərbəlayı Əli Xəlilova ithaf etdiyi “Ayrılıq belə düşdü” adlı kitabına məhz Kərbəlayı Əlinin

mənsub olduğu, ümumən Daşkənd nəsillərinin özəyini təşkil edən Rzalılar nəsli haqqında topladığım və sxematik şəkildə tərtib etdiyim şəcərəni də kitaba əlavə etməyi məsləhət bildi.

Rzalılar nəsli torpağın dərin qatlarından rişələnən əzəmətli çinar ağacına bənzəyir. Yeri gəlmişkən, qeyd edim ki, əslində elə "şəcərə" sözünün mənası da ağac anlamına gəlir. Bəzən şəcərəyə "nəsil ağacı" da deyirlər. Heç də gəlişigözəl söz mənasında mən bu nəsli çinar ağacına bənzətmədim. Daşkənd kəndində yaşayan nəsillər haqqında apardığım araşdırmalar nəticəsində bir neçə soyun məhz Rzalılar kökündən olduğu məlum oldu. Belə ki, kənd camaatının "İsmayıllılar", "Hacı Məhəmmədlilər", "Qocamanlılar", "Hacı Dünyamalılar", "Sarı Əlilər" kimi tanıdığı soylar elə Rzalılar nəslinin budaqlarıdır. Arxivimdə olan Əli Xəlilova mənsub əlyazmadan belə məlum olur ki, Rzalının (bəzən Rzalıya "Rza Qoca" da deyirmişlər) Məşədi Oruc, Hacı Kərim və Kərbəlayı Süleyman adlı övladları olub. 2007-ci ildə 85 yaşlı Qocaman Qocamanovla görüşlərimin birində adını daşıdığı Qocaman babası haqqında soruşarkən – "Qocaman babamın Hacı Məhəmməd adlı bir qardaşı olub. Onların atası Hacı Tanrıverdi isə Rzalının nəvəsidir", – dedi. Deməli, onda belə məlum olur ki, Hacı Tanrıverdinin atası Abdulla Məşədi Oruc, Hacı Kərim və Kərbəlayı Süleymanın qardaşıdır. Yeri gəlmişkən, sonralar Əli Xəlilov Rzalılar nəslinin

Hacı Söydümalı qolunun da İmişli rayonunda yaşadıqlarını öyrənmiş, onlarla əlaqə də qura bilmişdir. Hətta güman edirəm ki, ola bilər digər nəsillər də Rzalılar soy-kökündəndir.

Yazılı şəkildə təsdiqini tapmasa da, deyilənlərdən belə məlum olur ki, bu nəsil əslən Sulduz mahalından olub. Oradan əvvəlcə Sədərəyə, sonra Qazağa, daha sonra isə Göyçə mahalına köç etmiş, Daşkənd kəndində məskunlaşmışlar.

Rzalının oğlu Məşədi Orucun Xəlil, Zeynəb, Şirin və Abdulkərim adlı iki oğlu, iki qızı olub. Biz bu yazıda əsasən nəslin bu qolundan danışacağıq. Xəlilin üç övladı olub: Əziz, Oruc və Simuzər. Əzizlə Oruc qarayanız olduqlarından kənddə onlara bəzən "Qara Əziz", "Qara Oruc" da deyirmişlər. Bacıları Simuzərə isə daha çox "Simi nənə" və ya "Simi qarı" deyərdilər. 1980-ci ildə 110 yaşında rəhmətə gedən Simi nənənin Elbəyi, Qurban, Yunus və Balaxatın adlı övladları olub. Orucun isə Səttar və Lətifə adlı iki övladı olubdur.

Əziz Xəlil oğlu sovetləşmədən əvvəl Hüseynlə Xanların bacısı Şəkər Rəsul qızı ilə ailə qurmuş, Niftalı adlı övladı dünyaya gəlmişdir. Lakin bu ailənin ömrü uzun sürməmiş, Şəkər xanım hamımıza yaxşı məlum olan erməni daşnaklarının 1919-cu ildə Göyçə mahalında törətdiyi qırğınlardan canını qurtarıb Kəlbəcərə köç edərkən Sarı yer adlanan ərazidə qar çovğununa düşərək həlak olmuşdur. 1921-1922-ci illərdə göyçəli-

lər yenidən dədə-baba yurdlarına qayıtdıqdan sonra Əziz kişi qonşu Yuxarı Şorca kəndindən olan Abdulla qızı Reyhan ilə ailə qurmuşdur. İkinci evlilikdən Mahı, Sübə, Əli, Sənəm, Köçəri, Məsim və Məhluqə adlı övladlar doğulmuşdur.

1919-cu ildə anadan olan, ailənin ilk övladı Niftalı Xəlilov dövrünün savadlı şəxslərindən olmuş, Daşkənd kənd sovetinin sədri işləmişdir. O, dayısı Xanlar Kərimov ilə birlikdə nəinki Daşkənddə, hətta Basarkeçərin bir neçə kolxozunda da mühasib kimi çalışmışdır. 1941-ci ildə Böyük Vətən müharibəsinə səfərbər edilmiş, Primorsk ordusu 25-ci atıcı diviziyasının 54-cü atıcı alayında xidmət etmişdir. Niftalı Xəlilov 2 mart 1942-ci ildə Krımda döyüş zamanı almanlar tərəfindən əsir götürülmüş, əsirlikdən qaçaraq İtaliyada faşistlərə qarşı döyüşmüşdür. Müharibədən sonra Niftalı Xəlilov Sovet İttifaqının amansız qanunlarını qəbul etməyərək Türkiyədə yaşamağa üstünlük vermişdir. Niftalı Xəlilov (Əzizli) Ankara şəhərində yaşamış, Zinyət (1927 – 05.08.2001) adlı xanımla ailə qurmuş, Reyhan, Ayhan adlı iki qızı və İrfan adlı bir oğlu olmuşdur. 4 avqust 1980-ci ildə vəfat edən Niftalı Əzizli Ankarada dəfn olunmuşdur.

Ailənin ikinci oğul övladı Əli Xəlilov Rzalılar nəslində daha çox sevilən, rəğbət bəslənən, soyuna-kökünə bağlı bir el ağsaqqalı olmuşdur. Əli Əziz oğlu Xəlilov 1928-ci ildə Göyçə mahalının Basarkeçər rayonunun

Daşkənd kəndində anadan olmuşdur. 1935-ci ildə Daşkənd orta məktəbində təhsil almağa başlamış, 1945-ci ildə həmin orta məktəbi bitirmişdir. Bir il müəllim işlədikdən sonra kənd sovetinin sədri vəzifəsində çalışmağa başlamışdır. 1950-ci ildə hərbi xidmətə çağırılmış, zabit kimi xidmət etmiş, 1954-cü ildə doğulduğu kəndə qayıtmış, orta məktəbdə müəllim işləmişdir. Bundan sonra Daşkənd kənd sovetinin sədri, ferma müdiri, Subatanda (1964–1969) və Daşkənddə (1969–1971) kolxoz idarə heyətinin sədri vəzifələrində çalışmışdır. Hərbi xidmət zamanı Kommunist Partiyasının sıralarına daxil olan Əli Xəlilov 1972-ci ildən Daşkənd kənd partiya təşkilatının katibi vəzifəsində çalışmış, Ermənistan SSR-nin Fəxri Fərmanı ilə təltif olunmuşdur.

Əli Xəlilov 1967-1972-ci illərdə Özbəkistandakı Daşkənd Kənd Təsərrüfatı İnstitutunun aqronomluq fakültəsində oxumuş, 1974-cü ildə həmin institutda dissertasiya işini müdafiə edərək “Kənd təsərrüfatı elmləri namizədi” alimlik dərəcəsi almışdır.

Əvvəldə qeyd etmişdim ki, Əli Xəlilovun böyük qardaşı Niftalı Xəlilov Böyük Vətən müharibəsinə səfərbər edilmişdir. Müharibədən sonra geri dönmədiyindən həlak olduğu zənn edilmiş, hətta ehsanı da verilmişdir. 1952-ci ildə Gədəbəydə bir nəfər söhbət əsnasında Əli Xəlilova qardaşı Niftalının sağ olduğunu, onu İtaliyada gördüyünü söyləmişdir. 1953-cü ildə Stalin vəfat etdikdən sonra xarici ölkələrdə gizli yaşayan

SSRİ vətəndaşları öz yaxınları ilə əlaqələr qurmağa başlamışlar. Niftalı Xəlilov da bu fürsətdən istifadə edərək qardaşı Əliyə 1954-cü ildə ilk məktubunu yazmışdır. Əli Xəlilov Sovet İttifaqının dağılmasından istifadə edərək 1990-cı il iyul ayının axırı – avqust ayının əvvəllərində Türkiyədə olmuş, qardaşı Niftalının məzarını ziyarət etmiş, uşaqları ilə görüşmüşdür. Hal-hazırda da hər iki qardaşın övladları bir-biriləri ilə sıx əlaqə saxlayırlar.

Əli Xəlilov hərbi xidmətə getməmişdən əvvəl Simi bibisinin nəvəsi Sumaya Elbəyi qızı ilə evlənmişdir. Onların Ofeliya, İlham, Nurəli və Mahir adlı övladları dünyaya gəlmişdir. Əli Xəlilov soy-kökünü sevdiyi kimi, övladlarına da çox bağlı olmuş, təhsil almaları, cəmiyyətə və xalqa yararlı şəxsiyyət kimi formalaşmaları yolunda daim çalışmışdır.

1999-cu ilin fevral ayında Kərbalanı ziyarət edən Əli Xəlilov 2008-ci il aprel ayının 25-də, 80 yaşında dünyasını dəyişmişdir. Həyat yoldaşı Sumaya xanım isə 2005-ci il noyabr ayının 9-da vəfat etmişdir. Hər ikisi Bakı şəhərində dəfn olunmuşlar.

Bu gün bu ocağın od qoruyanı Kərbəlayı Əlinin böyük oğlu, bu kökün ağsaqqalı İlham Xəlilovdur. O, 1 iyul 1957-ci ildə anadan olmuş, Daşkənd kənd orta məktəbində VIII sinfə qədər oxuduqdan sonra təhsilini Bərdə rayonu Yeni Daşkənd kənd orta məktəbində davam etdirmiş və 1974-cü ildə orta məktəbi bitirmişdir.

1974-cü ildə Azərbaycan Politexnik İnstitutunun mexanika fakültəsinə daxil olmuş və 1984-cü ildə Azərbaycan İnşaat Mühəndisləri İnstitutunu bitirmişdir. 1977-1979-cu illərdə Gürcüstanın Tbilisi şəhərində hərbi xidmətdə olmuşdur. İlham Xəlilov institutu bitirdikdən sonra Azərbaycan Dövlət Üzümçülük və Şərabçılıq Komitəsində, daha sonra isə Azərbaycan Kənd Təsərrüfatı Nazirliyində işləmişdir. 2000-ci ildə "Rimlis" şirkətini qurmuş, hal-hazırda isə həmin şirkətin prezidentidir.

"Rzalılar nəsli" adlı yazımın sonunda qeyd etmək istəyirəm ki, bu nəslin Qara Əziz, Kərbəlayı Əli kimi soy-kökünü sevən, qohumcanlılıq, istiqanlılıq edən İlham Xəlilov, Mahir Xəlilov kimi nümayəndələri var. Mən əminəm ki, onların övladları, nəvə-nəticələri də belə olacaq, onların adını daim uca tutacaqlar.

**Araz YAQUBOĞLU,**
***tədqiqatçı***

## Rzalılar nəslinin şəcərəsi




Rzalı
Məşədi Oruc
Xəlil
Əziz
?-1955
Səttar
?-1954 (aprel)
Oruc
Lətifə
Cavad
Simuzər
1870-1980
Qurban
Yunus
Elbəyi
?-1941/45
Balaxatın
1926-2005


Xəlil
Şəkər 1890-1919
Rəsul qızı
Əziz
?-1955
Reyhan
Abdulla qızı
Niftalı
1919-1980
Mahı
Sübə
1926-1974
Əli
1928-2008
Sənəm
1933
Köçəri
1935-2010
Məsim
1938-2005
Məhluqə
1941


Xəlil
Əziz
?-1955
Niftalı
1919-1980
Zinyət
1927-2001
Reyhan
1952
Ayhan
1955
İrfan
1960


Xəlil
Əziz
?-1955
Əli
1928-2008
Sumaya 1933-2005
Elbəyi qızı
Ofelya
1955
İlham
1957
Nurəli
1959-2014
Mahir
1961


Xəlil
Əziz
?-1955
Köçəri
1935-2010
Səlmi
1939
İkram
1960-2006
Sevil
1967
Selyan
1969
Yaşar
1973


Xəlil
Əziz
?-1955
Məsim
1938-2005
Gülarə 1946
Məhəmməd qızı
Elmira
1963
Zöhrə
1965
Etibar
1967-2013
Kamilə
1969
Rahilə
1971
İlqar
1973-2006
Vüqar
1975


Əziz
?-1955
Əli
1928-2008
İlham
1957
Lena 1958
Əziz qızı
Ramin
1979
Mahı
1981
Şəhriyar
1985
Əli
1928-2008
İlham
1957
Ramin
1979
Türkan 1987
İlqar qızı
İlham
2013


Əziz
?-1955
Əli
1928-2008
Nurəli
1959-2014
Lida
Qarakişi qızı
Əzizə
1979
Əlişir
Ayhan
Əziz
?-1955
Əli
1928-2008
Mahir
1961
Bəsti 1970
Nəsif qızı
Niftalı
1990
Əziz
1991
Urfan
1995


Əziz
?-1955
Köçəri
1935-2010
İkram
1960-2006
Raya 1961
Muxtar qızı
Səbuhi
1983


Əziz
?-1955
Köçəri
1935-2010
Yaşar
1973
Firuzə
Aynurə
1994
Aypara
1996


Əziz
?-1955
Məsim
1938-2005
Etibar
1967-2013
İradə
Dünya
Xəlil
Nicat


Əziz
?-1955
Məsim
1938-2005
Vüqar
1975
Dünya
Leyla
2008


Rzalı
Məşədi Oruc
Abdulkərim
Qaraş
Məhəmməd
Gövhər
Bahar


Məşədi Oruc
Abdulkərim
Qaraş
Gədəbəyli
qızı
Məhəmməd
Suqra
Bayram
Fikrət
1959
Mədət
1961
Əmir


Rzalı
Məşədi Oruc
Xəlil
Simuzər
1870-1980
Cavad
Yunus
Qurban
Balaxatın
1926-2005
Elbəyi
?-1941/45
Reyvə


Qurban
Səhnə
Pəri
Əkbər
Elbəyi
?-1941/45
Mehri 1903-2001
Mahmud qızı
Sumaya
1933-2005
Minaya
1936
İbrahim
1938
İdris
1940


Elbəyi
?-1941/45
İdris
1940
Tərbiyə 1948
Abuzər qızı
Yuris
1970
Yaxşı
1972
Məlahət
1974
Rafiq
1976
Rəna
1978


Elbəyi
?-1941/45
İdris
1940
Rafiq
1976
Nahidə
1981
Aysu
2007
Nuray
2008
Rəsul
2011


Elbəyi
?-1941/45
İdris
1940
Yuris
1970
Arzu 1975
Canpolad qızı
Nigar
1998
Nərmin
1999
Murad
2005

## Rzalılar nəslinin İsmayıllı qolu













Abbasəli
Bəyiş ?-1959
Müzəffər 1940-1995
Şəfiqə 1943 Şuxu qızı
Şöhrət 1964
Yeganə 1966
Aqif 1969
Müşviqə 1971
Amil 1973
Turabə 1975
Həbibə 1978


Abbasəli
Bəyiş ?-1959
Müzəffər 1940-1995
Şöhrət 1964
Təranə 1972 İbrahim qızı
Elvin 1991
Eşqin 1993


Abbasəli
Bəyiş ?-1959
Müzəffər 1940-1995
Aqif 1969
Nurlanə 1976 Tofiq qızı
Mehrab
Müzəffər


Abbasəli
Bəyiş ?-1959
Müzəffər 1940-1995
Amil 1973
Turanə 1983 Şaban qızı
Hüseyn


Abbasəli
Bəyiş
?-1959
Səməndar
1952
Minə
Arzu


İsmayıl
Abbasəli
Səfər
1905-1941/45
Müxəstə 1906-1994
Muxtar qızı
Səltənət
1935-2013
Sənan
1937-2011


Abbasəli
Bəyiş
?-1959
Ələmdar
1955
Gülşən 1958
Nəriman qızı
Səbinə
Etimad
1985
Cəmaləddin
1988
Zeynəb
1990


Abbasəli
Səfər
1905-1941/45
Sənan
1937-2011
Telli 1935-2001
Məhəmməd qızı
Mübariz
1959
Ramiz
1961
Fazil
1963
Sevil
1967
Sara
1970
Leyla
1971
Asif
1975


Abbasəli
Səfər
1905-1941/45
Sənan
1937-2011
Mübariz
1959
Elmira 1963
Məsim qızı
Maxruq
1981
Könül
1987
Reyhan
1995


Abbasəli
Səfər
1905-1941/45
Sənan
1937-2011
Ramiz
1961
Raziyə 1961
Surxay qızı
Anar
1984
Səfər
1985
Gülnarə
1989


Abbasəli
Səfər
1905-1941/45
Sənan
1937-2011
Fazil
1963
Zəminə
Fərman qızı
Əminə
Orxan
Sənan


Abbasəli
Səfər
1905-1941/45
Sənan
1937-2011
Asif
1975
Sərxan
Gülnarə


Hacı Kərim
İsmayıl
Qurban
?-1965
Həlimə 1877-1987
Allahverdi qızı
Məhəmməd
1925-1985
Nəbi
1929-1963
Gövhər
1933
Səhər
1935
Xansuvar
İsmayıl
Qurban
?-1965
Məhəmməd
1925-1985
Nahad 1931
Həsən qızı
Hamlet
1953-1986
Validə
1956
Ofelya
1958
Çingiz
1960
Nailə
1962
Faiq
1964
Mülayim
1966
Zəminə
1968
Şamil
1973
İsmayıl
Qurban
?-1965
Məhəmməd
1925-1985
Tamara ?-1979
Əşrəf qızı
Hamlet
1953-1986
Püşarət 1959
Molla Əmirxan qızı
Səliqə
1979
Bəhruz
1982
Leyla
1984


İsmayıl
Qurban
?-1965
Məhəmməd
1925-1985
Çingiz
1960
Suyatel 1960
Nəbi qızı
Elgiz
1989
Məhəmməd
1991
İsmayıl
Qurban
?-1965
Məhəmməd
1925-1985
Faiq
1964
Müşviqə 1971
Müzəffər qızı
Həlimə
1992
Kənan


İsmayıl
Qurban
?-1965
Məhəmməd
1925-1985
Şamil
1973
Nuranə 1986
Hacı Ədalət qızı
Nihad
2005
İsmayıl
2008


İsmayıl
Qurban
?-1965
Nəbi
1929-1963
Gülgəz 1930
Şükür qızı
Səyyaf
1956
Naib
1958
Şahin
1960-1963
Mehman
1962


İsmayıl
Qurban
?-1965
Nəbi
1929-1963
Səyyaf
1956
Səyyarə 1957
Ağababa qızı
Müşfiq
1978
Rəhman
İlham
1982
İlqar


İsmayıl
Qurban
?-1965
Nəbi
1929-1963
Naib
1958
Cahan 1959
Əvəz qızı
Nail
1996
İsmayıl
1997


İsmayıl
Qurban
?-1965
Nəbi
1929-1963
Mehman
1962
Güldanə
Gülnar
1986
Sevinc
Banuçiçək
1989
Nəbi


Rzalı
Hacı Kərim
İsmayıl
Rəhim
Gülabatın
Cəmil
1885-1963
Rüstəm
(cavan ölüb)


Rəhim
Cəmil
1885-1963
Rəhim
1941-2005
Zibeydə 1950
Hümbət qızı
Şəhla
1970
Seymur
1972
Mərcan
1974
Mərdan
1977


Hacı Kərim
İsmayıl
Rəhim
Cəmil
1885-1963
Xeyransa 1900-1976
Məhəmməd qızı
Abuzəndə
1933
Göycə
1937
Rəhim
1941-2005
Güləbatın
1945


Cəmil
1885-1963
Rəhim
1941-2005
Seymur
1972
Nigar 1977
Rüfət qızı
Cəmil
2003
Nərgiz
2004


Cəmil
1885-1963
Rəhim
1941-2005
Mərdan
1977
Xavər 1975
Salman qızı
Fidan
2003
Rəhim
2006

# KİTABIN İÇİNDƏKİLƏR



## AYRILIQ BELƏ DÜŞDÜ
***(dastan-poema)***

